بسم الله الرحمن الرحیم


**نام کتاب:..........................................مرآثی.**

**گرد آورنده......................... .عبدالحسین آخونزاده**

**ناشر:.......................................... .شهریار**

**تاریخ چاپ:...............................1384**

**نوبت چاپ:.............................اول**

**تیراژ:......................3000**

**Kitabın adı:………..……….…Mərsiyələr**

**Toplayan:…..….Əbdülhüseyn Axundzadə**

**Nəşr edən:…………………………Şəhriyar**

**Çap tarixi:……………………….…..…2006**

**Çap növbəsi:……………………....Birinci**

**Tiraj:…………………………………3000**

**964-5934-54-0**

BİSMİLLAHIR RƏHMANİR RƏHİM

# *Münacat*

İlahi asiyəm,[1] vardır günahım,
Gözümdə əşk,[2] deldə[3] söz ahım,
Mənə rəhm eylə, qovma qapından,
Yoxum səndən sora ayrı pənahım.

Ey kane[4]-lütfü rizq[5] verən qovme-kafirə,
Lazımdı səcdə sən kimi bir bəndəpərvərə[6],
Ey hifzi abru eliyən ömrlər boyu,
Biabru gətirmə məni səhne-məhşərə[7].

# *Münacat*

Ey gözəl Allahım, bəndeye nalanam,
Əbre-baharan[8] tək hər gecə giryanam[9].
Başa çatır ömrüm matam və heyranam,
Etdiyim işlərdən indi peşimanam.
Gəlmişəm gecəylə mən dərgahüvə,
Bir nəzər qıl indi xatir xahüvə.
Əfv eylə bu bipənahı, ey Xuda,
Düz yolu nişan ver öz gümrahına[10]

---

[1] Üsyankar
[2] Yaş
[3] Ürəkdə
[4] Mənbə
[5] Ruzi
[6] Bəsləyənə
[7] Məhşər səhnəsinə
[8] Bahar buludu
[9] Ağlaram
[10] Azğın düşənə

Mən bir əbdi[1]-zəliləm, dərgahüvə dəxiləm.
Etdiyim ə`malə[2] indi gözüm ağlar,
Atəşe-həsrət və ahı-sinəmi çox dağlar,
Kim bu günahkarı həşrə kimin saxlar.

## *Ya ərhəmər-rahimin!*

Ey açan bəndələrə süfreyi-ehsan Allah!
Bizi et süfreyi-ehsanüvə mehman, Allah!
Xatire-xatəme- Peyğəmbər əmire-sələvat,
Bizi Qur`andan ayırma səni Qur`an, Allah!

And verrəm səni xeybər qapısın qalxızana,
Bizə hər müşkülü eylə özün asan, Allah!

Səni Zəhranın o sınmış qolu, yanmış qapısı,
Eylə biçarələrin dərdinə dərman, Allah!

Cü`də[3] məsmumi İmam Həsənin xatirinə,
Gəl bizi qovma qapından, sənə qurban Allah!

Yovme-aşirdə[4] Hüseynin dağılan xeyməsinə,
Alma tofiqi[5] bir ləhzə və bir an Allah!

Həzrəte-seyyide-Səccadidəki tabo-təbə[6],
Hamı bimarə[7] şəfa lütf elə,sübhan Allah!

---

[1] Bəndə
[2] Əməllərə
[3] Imam Həsəni (ə) zəhərləyən həyat yoldaşı
[4]Aşura günü
[5] Uğuru
[6] Dözümə
[7] Xəstələrə

Həzrət Baqirə həm Sadiqə xatir, ya Rəbb,
Öz qapından bizi qaytarma pəşiman, Allah!

Musa Ale-Mühəmməd ləqəbi Kazəme- ğeyz[1],
On bir il saldı ayaqdan onu zindan,Allah!

Bə`zi zindanilərin halinə vaqifsən[2] özün,
Ver nicatın ola ta şad və xuraman, Allah!

Dolduran şöhrəti Iranı Rza hörmətinə,
Eylə hər il bizi züvvare-Xorasan,Allah!

Keç Təqinin uzəme-şə`ninə[3] təqsirimizi
Eylə üsyanımızı şamile-ğüfran[4], Allah!

Samiranı eliyən cənnət Əliyyən-Nəqiyə,
Xaneye-qəbri bizə eylə çırağan, Allah!

Bar İlaha, Həsən Əsgərənin xatirinə,
Həşridə halımızı etmə pərişan,Allah!

Höccətibnil-Həsənil- Əsgəri Məhdiye əmin,
Eylə tə`cil zuhurunda köməkan, Allah!

Bizə eylə bu on dörd nəfərin hörmətinə,
Ey kərəm sahibi,ey xaliqe-Rəhman,Allah!

---

[1] Əsəbini udan

[2] Xəbərdarsan
[3] Uca məqamına
[4] Bağışlanma

Əlləri ki, ucalıb dərgəhe-ba izzətivə,
Naümid eyləmə ey Qadirü-Mənnan, Allah!

Mən Kərimi üzü qarə, əli boş, dərbədərəm[1]
Naümid eyləmə,ey sahibi-sultan, Allah!

## *Münacat (Ramazan ayı)*

Allah, Allah, nə gözəl aydı bu ay,
Rusiyəh[2] bəndələrə paydı bu ay.
Açılıb süfrə-e-ehsani-Xuda,
Süfrəye-rəhmət və ğüfrane[3]-Xuda,
Göz dikilib aləme-imkan Səmədə[4]
Hamı mehmandı Xudaye-Əhədə.
Açılıb eşqilə rəhmət qapısı,
Xar olan bəndəyə izzət qapısı.
Yatma ey aşiqi-şeyda[5] gecələr,
Səni gözlər həqqe yekta[6] gecələr.
Üzünü torpağa qoy nimə-şəb[7],
Sidqilə səslə ürəkdən "ya Rəbb!".
Yenə də Rəbb,düşüb eşqin başıma,
Gecənin aləmi gəldim qapına.
Qəlbimin qanı dolubdur gözümə,
Bağlanıb çox qapı əl`an[8] üzümə.
Sinəmə eşq oxunu sancmadılar,

---

[1] Avara
[2] Üzü qara
[3] Bağışlanma
[4] Allahən adı (yə`ni ehtiyacsız)
[5] Eşqə vurğun
[6] Yeganə Allah
[7] Gece yarısı
[8] Indi

Vurdum hər bir qapını açmadılar.
Günahım çox, keçib ömrüm yarıdan,
Var ümidim yenə sən tək tanrıdan.
Ömrümü gör nə təbah[1] eyləmişəm,
Hər tərəfdən günaha amacam[2],
Kərəm və lütfüvə mən möhtacam.
Qalmışam tək,necə bidadrəsəm[3],
Tabeye nəfs və əsire-həvəsəm.
Mənə rəhm eylə sən ey həyyi-qədim[4],
Əməlim yox görürsən boşdur əlim.
Meye ğəflət[5] məni məğrur eləyib,
Gör necə gözlərimi kor eləyib.
Çatdı ömrüm başa, ğərqe-günaham
Əlim əldən üzülüb rusiyaham
O qaçan bəndəyəm ey ruzi verən,
Daimən öz-özünə zülm eliyən.
Gərək eşqündə Xudaya, almışam,
Yenə gəldim gecə vəqti barışam.
Mən nə qədər elədim cürm və xəta[6],
Ondan artıq elədin lütf və əta.
Atəşe-şərmidə[7] yandım gəldim,
Özüm axırda utandım gəldim.
Aləmin əfvivə səlahiyyəti var,
Cahili əfv eləsən ləzzəti var.
Bilirəm məndə ləyaqət yoxdur,
Sənin amma kərəmin çox-çoxdur.

---

[1] Puç
[2] Hədəf
[3] Köməksizəm
[4] Həmişə var olan
[5]Qəflət şərabı
[6] Günah və səhv
[7] Xəcalət alovunda

Mən Hüseyn eşqinə del-bağlamışam,
Hər zaman adı gəlib, ağlamışam.
Etmişəm aləmə bu rütbədə naz,
Ona xatir adımı dəftərə yaz.

## *Imam Hüseynin (ə) eşqinə aid*

## *Canım Hüseyn (ə)*

Çıxanda canım, Hüseyn, bir dəqiqə lütf edəsən,
Bir ömür səsləmişəm can verəndə baş çəkəsən.
Ölən zamanda Ağa, gözlərim qalar qapıda,
O qədər gözləyərəm başım üstünə gələsən.

Kimin Hüseyn kimi aləmdə izzəti vardır?
Cəlal və mənziləti, şan və şövkəti vardır?
Hüseyn damənini boşlama, Hüseyn ağadır,
Hüseynə ağlamağın ayrı ləzzəti vardır.

Himmət şalın siz bağlayız belizə,
Qibtə edər hamı sizin elizə,
Hüseynə siz olun vəfalı nökər,
Qurban ollam Hüseyn deyən dilizə.

Əməl-e-xeyridə faiq deyiləm,
Bilirəm aşiqe-sadiq deyiləm,
İki aləmlərə sən şahsan, Hüseyn,
Mən gədayam[1], sənə layiq deyiləm.

---

[1] Yolçu

## *Salam olsun İmam Hüseynə*

Salam olsun   o susuz ləblərə[1] axan qanına!
Salam olsun   nigaran halilə çıxan canına!
Salam olsun   yaralı sinədə yatan balana!
Salam olsun   qanını qanına qatan balana!
Salam olsun   ürəyində qurtarmayan qəminə!
Salam olsun qəmi dərya əzalı Zeynəbinə!
Salam olsun  ürəyin tire-qəm[2] bölən ağama!
Salam olsun   su yanında susuz ölən ağama!
Salam olsun   qəm və ənduhu çox olan ağama!
Salam olsun   uca boy qardaşı ölən ağama!
Salam olsun   saralan gülşənə, solan bağına!
Salam olsun  ürəyində neçə cavan dağına!

## *Hüseyndir iftixarım*

İki dünyada Hüseyndir iftixarım,
Gözəl adı olub daim şüarım,
Nə mal, nə sərvət və nə şöhrətim var,
Vəli getsəm hara, var e`tibarım.

Hüseyn ibn Əli şəmse-hüdadı[3],
Peyğəmbərzadədi[4] nure-Xodadır[5],
Ətibba[6] naümid etsə mərizi[7],

---

[1] Dodaqlar
3Qəm oxu

[3] Hidayət-günəşi
[4] Peyğəmbər övladıdır
[5] Allah nurudur
[6] Həkimlər
[7] Xəstəni

Hüseynin dərgahi[1] darüş-şəfadır[2].

Hüseynə xidmət eylə aşiqanə,
Nəziri[3] gəlməyib, gəlməz cahanə
Öz oğlundan qulamın seçməyibdir,
Odur adı qalıbdır cavidanə[4].

## *Eşq olsun!*

Səni ziba[5] yaradan davərə[6] eşq olsun, Hüseyn!
Zate pakında olan gövhərə eşq olsun, Hüseyn!
Səni ərşə aparan şəhpərə[7] eşq olsun, Hüseyn!
Ya Hüseyn zikr eyliyən dillərə eşq olsun,
Hüseyn!

And ola qızlarının dildəki[8] nisgillərinə,
Zeynəbin Kərbu-bəlada çox olan qəmlərinə,
Əkbərin gözlərinə, Qasımın tellərinə,
Ucaboy qardaşının məşki tutan əllərinə,
Dini sən hifz elədin yeksərə[9], eşq olsun, Hüseyn!

Aşiqə fərq eləməz Kə`bə və bütxanə və deyr[10],
Harda yad olsa, ora qiblədi üşşaqə[11] nə ğeyr,

---

[1] Qapısı
[2] Şəfa evidir
[3] Oxşarı
[4] Əbədi
[5] Gözəl
[6] Allaha
[7] Qanad, lələk
[8] Ürəkdəki
[9] Başdan-başa
[10] Kilsə
[11] Aşiqlərə

Şüzəb, Hənzələ və Cündəb və Hürrilə Büreyr[1],
Şühəda şeyxi Həbib ibn Məzahirlə Zühəyr,
Müslim Övsəcə və amirə eşq olsun, Hüseyn!

## *Dərmanım Hüseyn (ə)*

Rəsmidir şanə[2] deyər zülfi-pərişanə sözün,
Andırar rəmzilə ta bilməyə biganə sözün.
Bu məlahət, bu lətafət ki, sənin var, cana,
Yeri vardır yazalar səfhəi-Qur`anə sözün.

Naz edəndə mənə nazında nələr var demirəm,
Açmaram özgələrə nərgise-məstanə sözün.

Hər zaman dərdin olanda de təbibin özünə,
Demədi mur[3] o zə`filə Süleymanə sözün.

Müftiyi-ə`zəm eşqin bizə fitvası budur:
Zülmdür kim deyə aqillərə divanə sözün.

## *Zəhra əzizi*

Bir gün olar yollara çox baxarsan,
Sinənə sən qəm oxunu taxarsan,
Qəbrin xarab olar, yaddan çıxarsan,
Hüseyn əzasındakı rəhmət qalar.

İltafidə[4] kimsə Hüseynə çatmaz,

---

[1] İslam fədailərinin adları
[2] Daraq
[3] Qarışqa
[4] Lütf etməkdə

Aləm səni gözdən ata, o atmaz,
Yaddan o şah nökərini çıxarmaz,
Onu Allah edib kərəmdə dərya,
Odur Mövla, odur əzize-Zəhra.

Hüseyn həbibidir Pərvərdigarə,
Hüseyndi ərş və fərşə güşvarə[1],
Hüseyn tək sahibe-fəzlo-kəramət,
Cahana gəlməyib gəlməz dübarə.

## *Növhə*

Mənzil-mənzil getmiş karvan,
Ya Hüseyn getdi əldən cəvani,
Heyf ola görmədim Kərbü-bəlani,
Ya Hüseyn, ya Hüseyn, ya Hüseyn can!

Ey şəhidi- rəhe-din və Qur`an,
Ayrılıqdan ürək oldu al-qan,
Mən dedim qəbrinə zair ollam,
Altıguşə gözəl qəbrinə qurban!

Ya Hüseyn can, gözü yolda qaldım,
Hey xəbər aşnalərdən aldım,
Sən anan canı bir bizlərə bax,
Getdi əldən cavanlıq, qocaldım.

Ya Hüseyn can, səni yada sallam,
Qara bayraqdan ətrivi allam,
Qəbrinə zair olsam mən ölsəm,

---

[1] Sırğa

Həşrə tək orda asudə qallam.

## *Şur*

Dünyaya sərvər ya Hüseyn! Ya Əba
Əbdullahil-Hüseyn!
Dillərə əzbər ya Hüseyn ! Ya Əba
Əbdullahil-Hüseyn!
Qurban mərame-eşqinə! Ya Əba
Əbdullahil-Hüseyn!
Azadə rəhbər ya Hüseyn ! Ya ƏIba
Əbdullahil-Hüseyn!
Əldə susuz ölən Hüseyn! Ya Əba Əbdulla
Hüseyn! Dinə fəda verən Hüseyn!
Ya Əba Əbdullahil-Hüseyn!
Ey şahe-Kərbəla Hüseyn Ya əba
Əbdullahil-Hüseyn
Ey nure Neynəva Hüseyn! Ya Əba
Əbdullahil-Hüseyn!
Dəryaye rəhmətdur qapın, Ya Əba
Əbdullahil-Hüseyn!
Biz etdik iltica Hüseyn! Ya Əba
Əbdullahil-Hüseyn!
Kəsmə inayətin ağa, Ya Əba
Əbdullahil-Hüseyn!
Bizdən xəta səndən əta, Ya Əba
Əbdullahil-Hüseyn!
Hicrunda yandı şiələr, Ya Əba
Əbdullahil-Hüseyn!
Dərdə gəlibdir sinələr. Ya Əba
Əbdullahil-Hüseyn!

Ey şahe məhşər və mina! Ya Əba
Əbdullahil-Hüseyn!
Ey dərdməndanə dəva! Ya Əba
Əbdullahil-Hüseyn!
Lütf eylə bu aşiqlərə, Ya Əba
Əbdullahil-Hüseyn!
Ağa bərate-Kərbala! Ya Əba
Əbdullahil-Hüseyn!
Hüseyn behiştin zinəti, Ya Əba
Əbdullahil-Hüseyn!
Hüseyn cəhanın izzəti, Ya Əba
Əbdullahil-Hüseyn!
Xune-Xudadır bu ağa, Ya Əba
Əbdullahil-Hüseyn!
Dillərdə var məhəbbəti, Ya Əba
Əbdullahil-Hüseyn!
Çırağı-asimanidir, Ya Əba
əbdullahil-Hüseyn!
Mərizlərə dərmanidir, Ya Əba
Əbdullahil-Hüseyn!
Sahibe izzo cahidir, Ya Əba
Əbdullahil-Hüseyn!
Iki cahana şahidir, Ya Əba
Əbdullahil-Hüseyn!
Aşiqlərə ətası var, Ya Əba
Əbdullahil-Hüseyn!
Ürəklərə səfası var, Ya Əba
Əbdullahil-Hüseyn!
Ürəklərə dolub nəva, Ya Əba
Əbdullahil-Hüseyn!
Ürəkdə çün yarası var, Ya Əba
Əbdullahil-Hüseyn!

Hüseyndi qəlbe-Fatimə, Ya Əba
Əbdullahil-Hüseyn!
Cahan batıbdı matəmə, Ya Əba
Əbdullahil-Hüseyn!
Gəl ağlayaq yarasına, Ya Əba
Əbdullahil-Hüseyn!
Səfa verək əzasına, Ya Əba
Əbdullahil-Hüseyn!
Ziyaye-çeşme Mustafa, Ya Əba
Əbdullahil-Hüseyn!
Müsibətində ağlayın, Ya Əba
Əbdullahil-Hüseyn!
Alın mərizizə şəfa. Ya Əba
Əbdullahil-Hüseyn!

## *Şur*

Dərgəhinin dəxiliyik , Ya Hüseyn
yəbnə-Zəhra!
Dinə fəda olan Hüseyn! Ya Hüseyn
yəbnə-Zəhra!
Zülmün əlilə qəlbinə, Ya Hüseyn
yəbnə-Zəhra!
Qırmızı qan dolan Hüseyn! Ya Hüseyn
yəbnə-Zəhra!
Dərdimizə dəva elə, Ya Hüseyn
yəbnə-Zəhra!
Mərizlərə şəfa elə. Ya Hüseyn
yəbnə-Zəhra!
Başa qara bağlamışıq, Ya Hüseyn
yəbnə-Zəhra!

Sinəmizi dağlamışıq, Ya Hüseyn
yəbnə-Zəhra!
Sən bil Əliyyü Əkbərin, Ya Hüseyn
yəbnə-Zəhra
Qanına qəltan Əsğərin. Ya Hüseyn
yəbnə-Zəhra
Dərdimizə dəva elə, Ya Hüseyn
yəbnə-Zəhra
Mərizlərə şəfa elə. Ya Hüseyn
yəbnə-Zəhra!
Dəhridə hər qədər varıq, Ya Hüseyn
yəbnə-Zəhra!
Damənivi buraxmarıq, Ya Hüseyn
yəbnə-Zəhra!
Biz yolunu bağlamarıq, Ya Hüseyn
yəbnə-Zəhra!
Millətе Kufə olmarıq. Ya Hüseyn
yəbnə-Zəhra!
Qoyma yanaq şəmatətə, Ya Hüseyn
yəbnə-Zəhra!
Biz də şataq səadətə, Ya Hüseyn
yəbnə-Zəhra!
Kəmininə batanların, Ya Hüseyn
yəbnə-Zəhra!
Qəlbinə ox atanların, Ya Hüseyn
yəbnə-Zəhra!
Əlləri şil olaydı kaş, Ya Hüseyn
yəbnə-Zəhra!
Xeyməvə od vuranların. Ya Hüseyn
yəbnə-Zəhra!
Dərd oturub ürəklərə, Ya Hüseyn
yəbnə-Zəhra!

Xəbər yetib Peyğəmbərə. Ya Hüseyn yəbnə-Zəhra!
Tutubdu ərş əza sənə, Ya Hüseyn yəbnə-Zəhra!
Eşqidə mərhəba sənə! Ya Hüseyn yəbnə-Zəhra!
Sahib-əzadı xuncigər, Ya Hüseyn yəbnə-Zəhra!
Ürəkdə Mustafa sənə. Ya Hüseyn yəbnə-Zəhra!
Qara çəkiblər göylərə, Ya Hüseyn yəbnə-Zəhra!
Yetibdi qəm mələklərə. Ya Hüseyn yəbnə-Zəhra!
Qur`ana can verən Hüseyn, Ya Hüseyn yəbnə-Zəhra!
Ləbteşnə can verən Hüseyn. Ya Hüseyn yəbnə-Zəhra!
Dərdimizə dəva elə, Ya Hüseyn yəbnə-Zəhra!
Dolubdu qəm ürəklərə. Ya Hüseyn yəbnə-Zəhra!

## *“Şiələr, namaz!”*

Hüseynə ağlamağın vardı yaxşı bir səməri,
Xamuş edər bəli duzəxdəki yanan şərəri.
Fəqət bu şərtilə ey aşiqane şahi-hicaz,
Hüseyn özü buyurub “Şiələr, namaz, namaz!”
Hüseyn namaza görə eliyubdir cəngü-cədəl,
Hüseyn namaza görə çəkdi itrətindən əl.

Hüseyn namaza görə teşnə baş və qan verdi,
Hüseyn namaza görə Əkbəre-cavan verdi.
Namazın ərzişinə bu işarəsi bəsdi:
Yazıllar Şümre-ləin səcdədə başın kəsdi.

## *Şiələrin müqtədası*

Hüseyndir Xaliqi ə`zəm fədası,
Hüseyndir dine-İslamın bəqası,
Hüseyndir aləmin zibo-səfası,
Hüseyndir şiəyanın müqtədası,
Hüseyndir ənbiyanın dilrübası.

Gözəldir çöhrəi-izəd nüması,
Cəmi kainatın rəhnüması,
Atasi Mürtəza şiri-Xudadı,
Anası Fatimə xəyrun-nisadı,
İki dünyanın olmuş pişvası.

O dəm ki, məqtələ sultan yıxıldı,
Gəlib səs höccəte-Rəhman yıxıldı,
Sütune-xanei-iman yıxıldı,
Səfa öldü, yerə irfan yıxıldı,
Olar həşrə kimi bərpa əzası.

Sərasər cismi olmuşdu qızıl qan,
Baxıb səmte-səmayə şahe-xuban,
Dedi sən şahid ol, ey həyyi-sübhan,
Hüseyn eliyib vəfayi-əhdo-peyman,
Minayi-eşq olubdur Kərbəlası.

İlahi üzmüşəm əl Əkbərimdən,
Ləb ətşan şirxarə Əsğərimdən,
Bəlalı itrətimdən yavərimdən,
Nənəm Zəhraya bənzər xahərimdən,
Mənə minnətdi eşqin hər bəlasə.

Sənin eşqində sərməstəm Xudaya,
Tərəktul-xəlqə turrən fi həvaka,
Və əytəmtul əyalə kulli əraka,
Və ləv qəttə`təni fil-həbbi irba
Ola qanilə möhkəm din binası.

Qərəz ərşe-Xuda qudalə düşdü,
Rüxe-zibaya qandan halə düşdü,
Yaralı Kə`bəyi-amalə düşdü,
Dilim gəlmir deyim nə halə düşdü,
Çıxıb əndazədən xəncər yarası.

Axardı yarəsindən qan sərasər,
Duranmazdı ayaq üstə o sərvər,
Gəlibdi naləyə yeksər mələkər,
Boyandı qanına Zəhra balası.

## ***Həqiqi Kə`bə Kərbəladı***

Ey dərdmənd, dərdə dəva Kərbəladədi,
Qorxma mərizin olsa, şəfa Kərbəladədi.

Əqlim dedi ki, beyti təvaf eylə hacı ol,
Eşqim dedi ki, beyti-Xuda Kərbəladədi.

Əqlim dedi şəbi-ərəfatın səfası var,
Eşqim dedi ki, şəbi ürəfa Kərbəladədi.

Əqlim dedi Minadə dua müstəcabidi,
Eşqim dedi həqiqi mina Kərbəladədi.

Əqlim dedi ki, sə`yi-Səfa qəlbi saf edər,
Eşqim dedi səfayi-səfa Kərbəladədi.

Əqlim dedi ki, zəmzəmin abi-həyatı var,
Eşqim dedi ki, abi-bəqa Kərbəladədi.

Əqlim dedi yəmin Xudavəndidir həcər,
Eşqim dedi cəmali-Xuda Kərbəladədi.

Çıx təlli Zeynəbiyyəyə,bax xeyməgahinə,
Insan elə bilir üsəra Kərbəladədi.

İllər qara geyib vurasan başə, sinəyə,
Allah bilir ki, əsli-əza Kərbəladədi.

Hansı ürəkdi titrəməsin qətligahidə,
Xəncər əlində Şümri-dəğa Kərbəladədi.

Min həccidən gözəldi Hüseynin ziyarəti,
Miqati-seyyidiş-şühəda Kərbəladədi.

Əqlim dedi nə sözdü ələstu bi rəbbikum,
Eşqim dedi bu qövlə bəla Kərbəladədi.

Oğlun rəva görənmədi qurbanlığa Xəlil,
Yetmiş iki xəzibe-dəma Kərbəladədi.

Əqlim dedi Xuda deyib Ud`uni əstəcib,
Eşqim dedi məqame-dua Kərbəladədi.

Əqlim dedi ki, Məkkənin ali həvası var,
Eşqim dedi o halü həva Kərbəladədi

Ya rəbb nəsib elə bütün həsrət çəkənlərə,
İndi tufaqilə rüfəqa Kərbəladədi.

Ərş əksi-Kərbəla ilə afaqə fəxr edər,
Misbahi-xəmsətun-nücəba Kərbəladədi.

Babül-həvaic həzrət Əbbasi-namdar,
Əl`an əlində qanlı liva Kərbəladədi.

Həllale-müşkül oğludur səqqayi-teşnələb,
Hər günə hacət olsa rəva, Kərbəladədi.

Qalmaz Kəriminin dəxi qəlbində həsrəti,
Görsə ki, hey`əti-şüəra Kərbəladədi.

Şirkət edər əimmə Hüseyn ərbəininə,
Hər ərbəin İmam Rza Kərbəladədi.

Zəhranı sən Bəqidə axtarma ey bacı,
Gəl Kərbəlayə, xeyrün-nisa Kərbəladədi.

Əqlim dedi yer üstə hanı bir gözəl məkan,
Eşqim dedi ki, Kərbübəla Kərbəladədi.

Qalmaz Kərimin dəxi qəlbində həsrəti,
Görsə bu hey`əti- şüəra Kərbəladədi.

Aşiqəm, düşmüşəm yaman günə mən,
Bənzərəm dağ başındakı günə mən,
Gülşən və gül əgər həvəsdi mənə,
Tək Hüseynin əzası bəsdi mənə.

* * *

Mən Kərbəlasız aləmi-imkanı neylirəm,
Eşq və məhəbbət olmasa, dünyanı neylirəm.
Ruze-cəzada rövzeyi-rizvana getmərəm,
Ali-Muhəmməd olmasa rizvanı neylirəm.

* * *

Eşqi-Hüseyni rövzeyi-rizvanə vermərəm,
Bəzmi-əzanı bağe-gülüstanə vermərəm,
Xaki-məzarı möhre namazımdı sübh və şam,
Bu möhrü mən negini- Süleymanə vermərəm.

* * *

Göz yaşını mən tamami-dünyayə vermərəm,
Ərzeşlidi bu gövhəri yəğmayə vermərəm,
Bir qətrə ki, behişt ala billəm bəhasına,
Allah bilir bu qətrəni dəryayə vermərəm.

* * *

Mərize- eşqəm əlac və davanı axtarıram,
Nişan verin mənə darüş-şəfanı axtarıram,
Hacı gedib Ərəfata Xuda ziyarətinə,
Hüseyn Hüseyn deyirəm mən Xudanı axtarıram.

* * *

## *Münacat*

İlahi rəhm qıl mənə, ürəkdə yarə gəlmişəm,
Bu asimanə üz qoyam, gedib dübarə[1] gəlmişəm.

Yatıbdı gözlər bu nimə-şəb[2],
Mənə nəzər qıl, amandı ya rəbb!

O bəndəyə ki, daimən gedib xəta, yorulmuşam,
Gəlibdi başıma nə çox qəm və bəla, yorulmuşam,
Haram var Xudaya mənim, gedim hara,
yorulmuşam.

Yatıbdı gözlər bu nimə-şəb,
Mənə nəzər qıl,amandı ya rəbb!

Gər etməsən nəzər Xuda,bu bəndələr xətərdədi,
Ürək ki, sındı bu güman nişanı əşk-tərdədi[3],
Özün buyurmusan yerim şikəstə[4] qəlbilərdədi.

Yatıbdı gözlər bu nimə-şəb,
Mənə nəzər qıl amandı ya rəbb!

---

[1] Yenidən

[2] Gecə yarısış

[3] Göz yaşları

[4] sınıq

Nələr gətirdi başıma cahanda nəfse-bihəya[1],
Ağardı baş-gözüm Xuda, nə qədri getmişəm xəta,
Mən ki, xəta elədim, sən etdin əfvilən əta.

Yatıbdı gözlər bu nimə-şəb,
Mənə nəzər qıl amandı ya rəbb!

## *Münacat*

Ey mahe-siyamı[2] bizə ehsan edən Allah,
Xane-kərəmə[3] bəndəni mehman edən Allah!

Ey mahe mübarəkdə açan süfrəye-ehsan,
Öz də`vətini insanlara elan edən Allah!

Bu ayda bizə lütf elə tofiqe-ibadət[4],
Ey Yunusa mahini[5] negəhban[6] edən Allah!

Bu sovmü-səlatı,şəlavatı-həsənatı[7],
Rədd eyləmə ey müşkülü asan edən Allah!

Hər yerdə məriz[8] olsa şəfa ver öz əlinlə,
Ey dərdlilərin dərdinə dərman edən Allah!

---

[1] Həyasız nəfs
[2] Orucluq ayı
[3] Kərəm süfrəsi
[4] Ibadət etmə uğuru
[5] Balıq
[6] Gözətçi
[7] Oruc- namaz- salavat- ehsan
[8] Xəstə

Ey Yusifi azad eliyən bənde-bəladan[1],
Zəncirin açıb Misirdə sultan edən Allah!

Hər hacəti-şər`iyyələri[2] eylə bəravərd[3],
Sənsən hamı nöqsanları cübran[4] edən Allah!

Ey həzrəti-Yə`qubu edən qüssədən azad,
Qomgəştəsini[5] varide-Kənan edən Allah!

Öz rəhmət ayından bizi gəl etmə peşiman,
Ey atəşe-Nəmrudu gülüstan edən Allah!

Yağdır bizə rəhmət yağışın əbre-səxadən,
Ey şəbnəmilə qönçəni xəndan edən Allah!

Qapılar açılıb bu gecələr name-Hüseynə,
Məqbul elədi gözləri giryan edən Allah!

Əfv eylə Kərimidə olan cürm və günahı,
Ey Hürrü xətasında pəşiman edən Allah!

## *On dörd mə`suma təvəssül*

Ey xatəme-Peyğəmbər, əl bizdən ətək səndən,
Ey müntəxəbe-davər əl bizdən, ətək səndən,
Lütf et bizə ey sərvər, əl bizdən, ətək səndən,

---

[1] Bəla-zənciri
[2] Şər`i istək
[3] yerinə yetir
[4] Aradan götürən
[5] İtirdiyini

Sənsən hamıya rəhbər əl bizdən, ətək səndən,
Sənsən ağa biz nökər, əl bizdən, ətək səndən.

Ey yavəre-məzluman, sən Heydəre-Səfdərsən,
Fərzənde-Əbu Talıb damade-Peyəmbərsən,
Sən şafei-məhşərsən, sən saqiye kövsərsən,
Sən aləmə məhvərsən, yer-göylərə sərvərsən,
Biz şiələrə sərvər, əl bizdən, ətək səndən.

Ey gövhəre-yeganə ya Fatimətəz-Zəhra,
Peyğəmbərə reyhanə, ya Fatimətəz-Zəhra,
Şəme-həqqə pərvanə, ya Fatimətəz-Zəhra,
Döndü ürəyin qanə, ya Fatimətəz-Zəhra,
Sadatə gözəl madər, əl bizdən, ətək səndən.

Ey gərdişe-əyyamın məhmumu Həsən canəm,
Ey firqeye-züllamın məzlumu Həsən canəm,
Ey səltənəte-Şamın məsmumu Həsən canəm,
Ale əbul-əytamın məşmumu Həsən canəm,
Xunin dəhən və müztər, əl bizdən, ətək səndən.

Ey sərvəre-məzluman, ləbbeyk Hüseyn, ləbbeyk!
Can dinə verən qurban, ləbbeyk Hüseyn ləbbeyk!
Din üstə ölən ətşan, ləbbeyk Hüseyn, ləbbeyk!
Ətfalı qalan giryan, ləbbeyk Hüseyn,ləbbeyk!
Ey tərcümeyi vənhər, əl bizdən, ətək səndən.

Ey tace-səre übbad, nure-bəsre zühhad,
Sər silsileyi-ovtad, sahibe-nəzəre-irşad,
Adı Əli ə`la ikən ləqəbi Səccad,
Biçarələrə çarə, hər bimədədə imdad,
Bimarlərə yavər, əl bizdən, ətək səndən.

Ey hər sitəmə sabir, hər hadisəyə Şakir,
Əsle-nəsəbi təyyib, zato-həsəbi mahir,
Elm və əmələ amil, helm və ədəbə mahir,
Həm nami Əbülqasım ziba ləqəbi Baqir,
Ey varisi-Peyğəmbər, əl bizdən, ətək səndən.

Ey sidqo-Sədaqətdə mesdaqe-səfa Sadiq,
Ey gənce-imamətdə dürr və göhərə layiq,
Didare-həqqə aşiq, ya Cəfərəs-Sadiq,
Sən əsbəq və sən sabiqsən, şayiq və sən vasiq,
Deldarələrə dilbər, əl bizdən, ətək səndən.

Ey həbsidə on dörd il zülmilə qalan mövla,
Ey qaiməyi-ərşə səbt olmuş adı lovla,
Sən babul-həvaicsən, sən mərtəbədə vala,
Harun sənə zindanda etdi nəqədr iza,
Musasən, atan Cəfər, əl bizdən, ətək səndən.

Ey mülke Xorasanı abad eliyən sultan,
Güldəstə qızıl gülbənd, şahanə qızıl eyvan,
Hər gün o gözəl qəbrə minlərcə mələk mehman,
Lütfün hamıya şamil, kane-kərəm və ehsan,
Dillərdə adın əzbər, əl bizdən, ətək səndən.

Ey cude-Cavad ilə cavid Təqi canəm,
Bir bəndeye-nalanəm, dərgəhuvə mehmanəm,
Sən babe kəramətsən, mən saile-ehsanəm,
Məhzun və pərişanəm, məğbun və pəşimanəm,
Lütf et bizə bir sağir, əl bizdən, ətək səndən.

Həmname Əbus-sibtəyn şöhrətdə Nəqisən sən,

Fərzənde Əba-Cəfər dilbənde-Təqisən sən,
Məzlume əzəldəsən, məsmume nəqisən sən,
Məhv oldu bəni Əbbas, cavid və bəqisən sən,
Ey qaide- namavar, əl bizdən,ətək səndən.

Ey yazdəhum kövkəb əbrace-vilayətdə,
Ömrün qurtaran hər şəb mehrabe-ibadətdə,
Zikri həmə-şəb ya rəbbe-ixlase-iradətdə,
Mövla Həsən Əskər bi məsəl-məhabətdə,
Ey ma xəlqə zivər, əl bizdən, ətək səndən.

Ey Müntəzər və Qaim, canlar aduvə qurban,
Mehdiyu-əbəl-Qasım, ey müntəqim və sultan,
Gəl dada ağa səslir imdadə səni Qur`an,
Zəhra yolunu gözlər əl sinədə sərgərdan,
Sənsən xələfe-Heydər, əl bizdən, ətək səndən.

Bu cümə negəhban et, Qur`ani-kərim Allah,
Məqbul elə banidən, ehsani kərim Allah,
Öz bəndələrindən geç, üsyanı kərim Allah,
Hifz eylə Kərimidə, imanı kərim Allah,
Ey bəndələrə yavər, əl-bizdən, ətək səndən.

## *Güftarə gəlmişəm*

Hər eşqi başdan atmışam inkara gəlmişəm,
Hər bəhsi, qurtarıb sərе-göftara gəlmişəm,
Mən bir yetim ki, çox qapılardan qovulmuşam,
Pak olmaq istərəm bu nəməkzar. gəlmişəm.

Bildim sənin kəramətin ey şahi-tacidar,

Oldum cəri, günah eylədim həqqə bi-şümar,
Düzdür ki, biləyaqətəm, amma bu qədər var,
Dərgahi baləyaqəti-əthara gəlmişəm.

Ey haqq yolunda bəzl eləyən başü canını,
Vey paye nəxle-dinə tökən pak qanını,
Ey naümid etməyən öz saribanını,
Dərgahüvə əlim boş, üzüm qara gəlmişəm.

## *Eşq cazibəsi*

Biz aşiqe-divaneyi-mümtaze Hüseynik,
İrad eləmə bizlərə sərbaze-Hüseynik.
Sidqilə yapış həzrəte Əbbas ələmindən,
Rədd eyləsə möhtacı uzaqdır kərəmindən.
Bidin deyilik tərk eliyək nadə Əlini,
Qur`anı tutub boşlayaq övlade-Əlini.
Qur`anı sərəfraz eliyən xuni-Hüseyndir,
Qur`anə qəsəm name-Hüseyn zinəti-dindir.
Həsrətlə vurub sinəyə qara geyərik biz,
Hər mahi-məhərrəmdə"Hüseyn vay!" deyərik biz.
Xoş halına hər kəs ola vabəstə Hüseynə,
Etsə özünü nökəre-şayəstə Hüseynə.
Hər dərdin ola ərz elə dərmanı Hüseyndir,
Hər çarəsizə çarə,Hüseyn canı,Hüseyndir. Hər kəs bilə bu ağlamağı dinidə bidət,
Qəlbində onun yoxdu yəqin mehre-vilayət.
Mə`nadə Hüseynə hamı cinnü bəşər ağlar,
Zahirdə vəli şiyeyi-isna-əşər ağlar.
İxlas ilə tut daməne-şahi şühədadən,

Qurtar özünü məhləkeyi ruzi-cəzadən.
Məhşərdə şəfaət edən insana Hüseyndir,
Çün qasim olan nur ilə nirana Hüseyndir.
Asilərə bil şafe-i üsyan Hüseyndir,
Biçarələrin dərdinə dərman Hüseyndir.
Gər həşrə qədəm qoymasa salare-şəhidan,
Olmaz bu gunahkarlarin dərdınə dərman.
Bir gün gələcək məhşərə Əsğər qucağında,
Əldə yaralı başı, qızıl qan dodağında.
"Ya həqq" gələcək peykərinin hər yarasından,
Qanı axacaq başdakı xəncər yarasından.
Hər yerdə Hüseynə quralar məclisi-matəm,
Zəhra gələr ol məclisə bişübhə müsəlləm.
Batində bu göz yaşları bir dürre-səmindir,
Bazare-qiyamətdə xəridarı Hüseyndir.
Bu ağlamaq izhari əlayiqdi Hüseynə,
Biz neyliyək Allah özü aşiqdi Hüseynə.
Bir qətrə Hüseynə edəsən göz yaşı cari,
Təqsirun əgər olsa keçər həzrəti Bari.
Ey müştəri raicdi bu bazaridə təqva,
Bu mətləbi lazımdı əzadaridə təqva.
Dəstgahe-Hüseynin hamısı dinə sipərdi,
Bağ fərz eləsək dini bu o bağa çəpərdi.
Bu cəmi-siyəhpuş əzadari Hüseyni,
Manəndi çəpər saxlayacaq hasili dini.
Ta dinimizin əsli nigahbanı gəlincə,
Qur`anımızın mücriyi fərmanı gəlincə.
Bu qarə ələmlər hamısı pərçəme-dindir,
Asari-Əbulfəzli ələmdari-Hüseyndir.
Hər kim buna tohin edə sui ədəbindən,
Qorxsun gərək Əbbasi-Əlinin qəzəbindən.
Təhqir ilə hər kəs baxa bu pərçəmi dinə,

Şümr ilə müsavidi, qəsəm cane Hüseynə!
Bir məktəbe din açdı Hüseyn Kərbübəlada,
Himmət kəmərin bağladı islahe fəsada,
Bir nehzəte-xunin eliyib dini ucaltdı.
Batilləri mənkub eliyib məqsədə çatdı,
Həqq üstə qəfadən başını kəsdilər ətşan.
Baş nizə başında yaralı başladı Qur`an,
Ey şahe-qəfadan kəsilən başuvə qurban!
Din üstə ölən oğluva qardaşuva qurban!
Həqdən yetişən rütbəyi-mümtazına qurban!
Neydə danışan başıva-e`cazına qurban!
Inkar edən e`cazivi ey əshabe e`caz,
Bir iddə bəhayimdi ki insanə qarışmaz.
Ünvan eləyiblər ki, kəsik baş danışanmaz,
Şəqqül-qəmərin münkiri e`cazə inanmaz.
Həqq üstə ölən zindədi əz ruye həqiqət,
Ayate "limən yüqtəli" get eylə tilavət.
Ey nizədə kəhf ayəsin irad eləyən baş,
Həqq dinə məsihiləri irşad eləyən baş.
Eylə bizədə bir güşəye çeşmilə nəzarə,
Səndəndi günahkarların dərdinə çarə.
Məhşərdə Xudadən sizə var izne-şəfaət,
Siz gəlmiyəsiz ümmətə yox rahe səadət.
Xilqətdə tüfeylidi sizə ma xələqəllah,
Sən vasitə ol ta bizi əfv eyləsin Allah.
Qoydun başıvı bir gecə kül üstünə yatdın,
Bir ömür vəli şiələrin başın ucaltdın.
Dünya nə qədər var bilirik zindədi namın,
Məscidlərə minbərlərə zibəndədi namın.
Şeşguşə məzarın bizə firdovsi-ə`ladır,
Qurban o gözəl türbətə ki, xake-şəfadır.
Züvvar gələndə vətənə kərbu-bəladən,

Tohfə gətirərdi bizə o xaki-şəfadən.
Baxdıqca o möhrə səni biz yadə salardıq,
Ətrin o gözəl xake-müqəddəsdən alardıq.
Hərdən çevirən vəqtidə üz qibleyi-razə,
Şövq ilə qoyardıq onu biz cayi-namazə.
Müddətdi vəli sinəmizi dağlı qoyubsan,
Züvvarivə şaha yolivi bağlı qoyubsan.
Indi yeri var kasəye-del qanilə dolsun,
Az qaldı ki, evlərdən o türbət də qurtulsun.
Göz yaşları şaha, nə qədər arizə axsın?
Züvvar desin ey vay Hüseyn vay,yola baxsın?
Aç yollarivi bağlı qalan yollara qurban,
Eşqində su üstə kəsilən qollara qurban.
Bir ömür bizə maye-ye həsrətdi fərağın,
Olmur bizə qismət o gözəl səhnü rəvaqun.
Bir ömür Kərimi üzə əşkin ələr ağlar,
Gər ölməsə bir vəqfə o qəbrə gələr ağlar.
Mən fəxr edirəm xadime-dərbare-Hüseynəm,
Dünyayə gələn gündən əzadare-Hüseynəm.

## *Kərbəla arzusu (cuş)*

Yenə düşübdü başıma həvaye-Kərbəla, Hüseyn!
O altıguşə qəbrivə atam-anam fəda Hüseyn!

Rəvadı şiələr məgər yana sənin fəraquvə,
Yanır ürək, alovlanır düşəndə iştiyaqivə,
Nolur nəsib ola, gələk o xoşnuma rəvaqivə,
Geyək qara, məhərrəmi tutaq sənə əza,Hüseyn!

Sənin qapında seyyida nolur ki, imtiyaz alaq,

Nəsib ola ziyarətin əzəlcə bir cəvaz alaq,
Gedək ürəkdə möhnətun fəratə dəstəmaz alaq,
Deyək əzize-Fatimə, zəbihe mən qəfa Hüseyn!

Nolur ki, şahilər baxa məhəbbətilə nökərə,
Məhəbbət eylə istəsən o mərqəde munəvvərə,
Ayaq tərəfdə üz qoyaq məzare-paki- Əkbərə,
O altıguşə mərqədi öpüb edək nəva Hüseyn!

O səhni taqü günbəde təlayə canımız fəda,
Səfa və mərvədə gözəl səfayə canımız fəda,
Minaye-Kə`bədən gözəl minayə canımız fəda,
Cəvare-rəhmətindəki fədalərə fəda, Hüseyn!

Nə qədri əşko ah ilə fəraqüvə dəvam edək,
Nolar gələk məzarüvə cahanda əxze-kam edək,
O pire-pak o şah müqəddəsə salam edək,
Tutaq məzarının tozun misale-kimiya, Hüseyn!

O qəbri pakı şut edək, cahanı biz şərər salaq,
Şəmime-ətre-cənnəti məzare pakidən alaq,
Ana dilicə Əsğərə sinəndə laylay çalaq,
Sinəndə yarəli yatıb o südəmər bala, Hüseyn!

Öpək sənin məzarını, bataq məlal və matəmə,
Gedək ziyarət etməyə kənare-nəhre-Əlqəmə,
O xırda qəbridən öpub edək bu növi-zümzümə:
Yatıb bu yerdə mə`dəni səxavət və vəfa Hüseyn!

## *Kərbəlada Aşura*

Bəh-bəh bu il Məhərrəmin özgə səfası var,
Dillərdə eşq, başda ziyarət havası var.
Min karvan gedir Nəcəfə dildə ya Əli,
Həm Kazimeyni, Kufəsi var, Kərbəlası var.
Bu il Məhərrəm açılıb rahe-Kərbəla
Züvvare-mərd və zən cavanı var, qocası var.
Də`vəte-umumidi açılıb süfreye-kərəm,
Gəlsin bu bare-amə kimin iştahası var.
Bir vəch kim salıb əlinə üz qoyub gedər,
Gərçe haman pula başının min bəlası var.
Züvvarə kim xəyanət edə pis günə qalar,
Fürsəttələb qəziyyəni bilsin cəzası var.
Fürsəttələb qalar mütəvəkkil qalan günə,
Züvvarın ahının əsəri qəm fəzası var.
Bu il Məhərrəmin daxi ya ləytənası yox,
Kunna məək demə, yol açıqdı, səfası var.
Bu il o altıguşə məzarın ziyarəti,
Hər kimsəyə nəsib ola, feyze- xodası var.
Şaxseləri, ələmləri, heyətləri tamam,
Bülvare-Kərbəlayə çəkib, mərhəbası var.
Bülvare-Iərbəladə durub sinə vurmağın,
Beynül-hərəmdə nəşəyi biintəhası var.
Bulvare-kərbəla iki cənnət müqabili,
Mərv və Səfadı, hərvələsi var, duası var.
Kimdir Hüseyn? Ziyarəti Allah ziyarəti,
Mə`bud ilə onun gözəl əhd və vəfası var.
Kimdir Hüseyn? Peyğəmbərin ağuşunun gülü,

Qur`anda şə`nə sahibdir kafo hası var.
Kimdir Hüseyn? Həzrəti Zəhraya sevgili,
Şayəstədı məqami hədisi-kisası var.
Kimdir Hüseyn? Fərşi edib ərşidən şərif,
Çeşme-cahanı tərbiyətinin tutiyası var.
Qurban olum Hüseynə ki, min dörd yüz il keçir,
Əkdikləri gülün hələ nəşvü nüması var.
Hər dərdmənd dərdi ki, sə`bul əlacidir,
Gəlsin desin, Hüseyn qapısında dəvası var.
E`lan edin mərizlərə binəvalara,
Ərbabımız təbibidi, darüş-şəfası var.
Şeşguşə bir zərihidə şeşguşə bir məzar,
Fikr etmə Kə`bənin elə ali binası var.
Başsız yatıb o qəbridə bir sərbedare-eşq,
Oğlun ziyarət etməyə payini-pası var.
Busə edir ata ayağından cavan oğul,
Bir dörd min oxlu sinədə dilsiz balası var.
Şeşmahə bir bala sıxılıb qanlı sinəyə,
Səs çıxmır ağlaya, boğazında yarası var.
And olsun Allaha, qapıdan boş qayıtmayıb,
Hər sailin gözəl ədəbi var, həyası var.
Mövla ədəbli nökəri istər, ədəblidi,
Əhsən o nökərə ki, Hüseyn tək ağası var.
Tənha ədəbdi bəndəyə şəxsiyyət artıran,
Baxma bir dəstənin həbibinin əskinası var.
Mövla buyurdu əl-ədəb xəyrun min zəhəb,
Mədrəki-ədəbdi, baxma esanso təlası var.
Al dəstəmazı, qarəni gey qıl namazını,
Mövlasına namaz qılanın iqtidası var.
Vur sinəyə ya Hüseyn de, namaza müvazib ol,
Səndən cəmaətin də dua iltiması var.
Gözlə o qara köynəyin ehrame həccidi,

Əynində möhtərəmsən,Hüseynin qarası var.
Çoxlar bu qara köynəyə təhqir ilə baxır,
Sevmir Hüseynçün görə meşkin qəbası var.
Çoxlar əzada noqteyi-zə`f axtarır bizə,
Şaxisi nədi elmlədi çun və çerası var.
Şaxisi-təzahurat Hüseynidi,şiələr,
Ta Şiə var cahanda bu rəsmin bəqası var.
Payəndə bad pərçəme hurriyyəti Hüseyn,
Hər il bu bə səfa ələmin e`tilası var.
Hamildi hamiyi-pərçəmə səqqayi-Kərbəla,
Əbbas tək hünərvər və sahib ləvası var.
Əbbas ağa, düşən qola bu şiələr fəda,
Bir məşk su qana dönə axa bəhası var.
Qolsuz bədən düşəndə at üstdən necə düşər?
Əmmamə yox başında? gözündə yarası var.
Gördü vəfalı mərkəbi yorğundu sahibi,
Qaçdı sağa-sola hara getsin harası var?
Göz yox görə haya yıxılır hara gedir,
Gəldi üz üstə torpağa, va həsrətası var.
Başın ucaltdı göylərə qolsuz yıxılmağı,
Vazehdi bu yıxılmada Allah rizası var.
Səsləndi seyyidi, ölürəm gəl hərayıma,
Əbbasivun nə bir kəsi nə aşinası var.
Sınmış baş üstə keşməkeşə, qilo qalə bax,
On yeddi kafirin başına iştirası var
Görmür gözüm şəmatət edir hər gələn vurur
Əbbasa düşmənin süxəni- narəvası var.
Daşlar gəlir üzümü kənara çəkənmirəm,
Bir yarəyə demə vuranın ixtifası var.
Ox sancılıb oxa, qarışıb yarə yarəyə
Bir dərdə düşmüşəm nə əlaci dəvası var.
Şaha, Kərimiyəm, kərəmindən pay istərəm,

Gərçe sənin gözəl qapının çox gədası var.
Ölsəm bu qara köynəyilə dəfn edin məni,
Görsünlər eşqimin sənəde-iddiası var.
Qoymaz ağam Hüseyn iki dünyada xar olam,
Əldə Kəriminin sənəde mən bəkası var.

## *Kərbəla məqamı (cuşi)*

Çün həzrət Adəm yetişib Kərbübəlayə,
Qəmli ürəyi dərdə gəlib gəldi nəvayə
Səs gəldi dayan, burda əza saxla Hüseynə,
Torpağını öp oxşama de, ağla Hüseynə.

Nuhun gəmisi aləmi qoymuşdu qəfadə,
Gəldi keçə girdabə düşüb Kərbübəladə,
Can qaldı xətərgəhdə gözü ərşi Xudadə,
Cəbril dedi cuşə gəlib bəhri-təfəzzül,
Vursan da Hüseyn daməninə dəsti-təvəssül.

Yol saldı o səhraya Xəlilullah at üstə,
Birdən yıxılıb atdan olub fərqi şikəstə
Üz tutdu göyə baş yaralı peykəri-xəstə
Fovrən ona da gətdi xəbər peyki-əvamir:
"Cuş etdi sənin qanın Hüseyn qanına xatir".

Ismailin əhşami-pəsəndidə sifatı,
Daim mələşib içmədilər abi-fəratı,
Heyrətdə qalıbdır kəsilib səbro səbatı,
Səs gəldi qoyundan-quzudan qıl bu sualı,
Etsinlə səni ta bu yerin sirrinə halı.

Həsrətlə o dilsizlərə bir etdi nəzarə,
Qüdrət əli qıldı hamısın əhli işarə,
E`caz elədi müşküli-Ismailə çarə,
Gəldi dilə dilsiz quzular etdi təzahür,
Bu çöldə suvarma bizi sən Əsğərə xatir.

Fərşilə həva üstə gəzən vəqtdə Süleyman,
Təxtin çevirib vurdu yerə şiddəti-tufan,
Ərz eylədi ya Rəbb, görülüb məndə nə nöqsan,
Səs gəldi ki, çox tünd gedirsən belə getmə,
Vəhşətlidi bu vadiyi-iymən belə getmə.

Bu çöldə Hüseyni qəmə amac edəcəklər,
Zülm ilə onun təxtini tarac edəcəklər,
Qızlarını bir mə`cərə möhtac edəcəklər,
Bu çöldə Hüseyn də batacaq qana Süleyman,
Düş ağla o məzlumi-Süleymanə, Süleyman.

Musa da gəlib bir gün o səhrayi-bəlayə,
Batdı bir ayağına tikan gəldi nəvayə,
Cəbril dedi sən də cülus eylə əzayə,
Bu çöldə Hüseynin hərəmi baş açacaqdır,
İstəkli Səkinə tikan üstə qaçacaqdır.

Bir gün də Məsihin yolu düşmüşdü zəruri,
Yanında həvariləri, başında qüruri,
Bir şir-qəvi pəncə kəsib rahe-üburi,
Səsləndi həvariləri ğeyzilə o saət,
Kəsdin yolu Ruhullaha aya nədir illət?

Səsləndi həvarilərə ba qeyzo-cəsarət,
Aşuri-Məhərrəmdi bu rəftarıma illət,
Vadar eləyir dildəki pünhanı məhəbbət,
Hər kim ki, hər il düşsə bu səhrayə güzari,
Də`vət edərəm mənlə edə nohəvo-zari.

Yandı hamı əlqissə ürəkdən bu məqalə,
Hüzzar onun dövrəsinə vurdular halə,
Torpaq sovurub başa o şir eylədi nalə,
Səsləndilər ey ruhi-məsiha sənə qurban!
Məryəm sənə qurban, ağa Isa sənə qurban!

## *Ünvanımız Hüseyndir*

Hər qasidin səfası badi-səba olanmaz,
Hər səngrizə almas, hər quş huma olanmaz,
Hər təxtə parə minbər hər daş təla olanmaz,
Tək kağız və mürəkkəb müşkül-güşa olanmaz,
Həllali-müşkilat olanımız Hüseyndir.

Bu qəlbi sol tərəfdə xəlq eyləyibdi xaliq,
Vursun sağ əllə sinə kimdir Hüseynə aşiq,
Olmaz ona müvəffəq dəsti-çəpi-xəlaiq,
Qəlbün tökülsə zəng, rövşən olar həqaiq,
Əlhəqq səfayi qəlb və imanımız Hüseyndir.

Bir az gərək döyülsün hər zəngdari-ahən,
Qəlbində zəngi vardır vur sinə eylə şivən,
Ayineyi-həqaiq olsun təraz və rövşən,

Ondan qəzavət eylə gör sünnü həqdi ya sən,
Vallah sübuti-həqqə bürhanımız Hüseyndir.

Nisbət verirlər guya bir alimi cəlilə,
Zəncanda yalvarırmış xəllaqi-bi bədilə,
Ya, Rəbb vəbanı göndər Zəncandan Ərdəbilə,
Eşqi-Hüseyn olarda artıqdı bu dəlilə,
Sinə vurub deyərlər dərmanımız Hüseyndir.

Əlan gəl Ərdəbilə ey alimi-girami,
Diqqətlə eylə rö`yət divar və səqf və bami,
Bax gör nələr görərsən İslamə ver səlami,
Bəndə Hüseyn firuşəm, adım Hüseyn qulami,
Ə`malımız Yəzidi, unvanımız Hüseyndir.

Əhli-Əraqə bənzər hər kimdə var bu xislət,
Zər bədrəsin görəndə eylər Yezidə bey`ət,
Zərd oldu sim və zərdən axır güli-şəriət,
Səsləndi nökəranimuzduru bi şərafət,
Şəmşirizi itildin, mehmanımız Hüseyndir.

Hey əsləhə düzəltdi ahəngərani-Kufə,
Zəhrilə verdilər su sərnizə və süyufə,
Min-min gəlir süvari mülhəq olur süfufə,
Qatil yığışdı yüz min bir seyyidi rəufə,
Hökm oldu kim qətili ətşanımız Hüseyndir.

Gördü Həbibi Müslim bazaridə pərişan,
Ərz etdi keyfə əsbəht ey piri əhli iman,
Bir bax, dedi, Həbibi necə qocaltdı dövran,
Rəng və hənayə bir az var ehtiyacım əl-an,
Bu gün dəvayi-dərdi-hicranımız Hüseyndir.

Müslim dedi bəs onda yox lütf bu hənadə,
Bir namə var ağamdan ol mənlə həm iradə,
Bu nisfi-şəb geyin gəl, gizlin gedək cihadə,
Yaxşı həna satırlar bazari-Kərbəladə,
Biz bəndəqane-eşqik sultanımız Hüseyndir.

Hər kəs gəlib evində geydi səfər libasın,
Andırdı bir dililə öz yari  aşinasın,
Ağlar qoyub dalıyca həsrətli əqrəbasın,
Gördü Həbib əyalı başə salıb əbasın,
Ağlar deyir ağamız, cananımız Hüseyndir.

Müddətdi mən ağamın hicrində əşkrizəm,
Xişo-təbarə gərçe hörmətliyəm əzizəm,
Zindanidir bu Kufə, amadeyi qorizəm,
Sən ol Hüseynə nökər, mən Zeynəbə kənizəm,
Gənci-nihani-qəlbi-viranəmiz Hüseyndir.

Hasil gəlib çıxıblar səhrayi-Kərbəlayə,
Diqqətlə baxdılar bir cəvlangəhi-bəlayə,
Bir yanda cəngi və tar və tənburi-piyayə,
Bir səmtidən ucalmış Qur`an səsi səmayə,
Səsləndilər o sovti xoşxanımız Hüseyndir.

Verdi qərəz uzaqdan Qur`an səsi güvahi,
Qəsd etdilər piyadə o ruyi-padişahi,
Əbbasi-namidarə görsəndi bir siyahi,
Şərzə gedib Hüseynin şir büləndi-cahi,
Səsləndi ey gələn dur mizanımız Hüseyndir.

Olsaz əgər Hüseynçi, azadisiz xiyamə,

Şayəstəsiz göz üstə, çox izzi-ehtiramə,
Amma müxalif olsaz, mən istəyən imamə,
Şəmşiri eylə vurram başız gələr səlamə,
Gün rükni-xəlq kövni-imkanımız Hüseyndir.

Gördü Həbib uzün qol, kəskin qılıncı üryan,
Səsləndi mən Həbibəm, ey şiri-mərdi- meydan,
Əbbas sən də mən də yalqız Hüseynə qurban,
Gəldim bu ağ məhasin qanilə olsun əlvan,
Nuhi-nicat-bəxşi tufanimiz Hüseyndir.

Qərq oldu qeyrətindən Əbbas göz yaşında,
Bir söz dedi Həbibə ağlatdı yoldaşın da,
Əmr elədi üzəngi bağla əyir qaşında,
Qorxar, bu xeymələrdə bir qız var üç yaşında
Hər ağlayanda qəlbi-suzanımız Hüseyndir.

## *Kərbəla*

1

Adın dillər əzbəridir, Kərbəla!
Ürəklər olub qan,Kərbəla!
Torpağın kimya, Kərbəla!
Kərbəla, Kərbəla, Kərbəla!

2

Qəmlisən, bir adın neynəva,
Sənə çoxlar deyir Kərbəla,
Türbətin olub xaki-şəfa,
Fəxr eylə hər zaman, Kərbəla!

3

Səndə gülzari-taha soldu,

Əşki-həsrətlə gözlər doldu,
Su dönüb başdan başa qan oldu,
Yandı cavan və qoca, Kərbəla!

4

Yandırar möhnətin dünyanı,
Ağladar hər zaman Zəhranı,
Dərbədər eylədin əhli hərəmi,
Oldu bi xaniman, Kərbəla!

5

Tuşəyi-qəm əşcəi-nas oldu,
Namurad qolsuz Əbbas oldu,
Təşnə ləb verdi can Kərbəla!

6

Səndə Əsğər nə kamə çatdı,
Nə dil açdı nə bir boy atdı,
Su yerinə içib qan,yatdı,
Qundağı oldu qan, Kərbəla!

7

Zülmü-əşrarə bu söz bəsdi,
Gör Hüseyn başını kim kəsdi,
Əl aman əl aman,Kərbəla!

8

Səndə Zeynəb töküb göz yaşın,
Qüssəvü-qəm ağartdı  başın,
Tapdı qudalidə qardaşın,
Etdi ahü-fəğan,Kərbəla!

9

Səndə çox-çox dürrülər yandı,
Xeymələr zülmülə odlandı,
Zeynəbin qolları bağlandı,
Məhşər oldu əyan, Kərbəla!

## *Məhərrəmin yetişməsi*

## *Nohə*

Yetişdi Məhərrəm açıldı pərçəm, Quruldu bəzme-əza Əbulfəzl.
Nəvayi-zümzümə sədayi-əlqəm, Axanda səslər ki, ya Əbulfəzl!

Ürəkdə dağlar, kiçik uşaqlar geyiblər yeksər qara libası,
Hər evdə bərpa olub təkaya yenə quruldu Hüseyn əzası,
Gəliblər şövqə deyillər nöhə, düşübdü şəhrə əza sədası,
Nəvayə bir bax, əzayə bir bax, deyillər müşgül quşa Əbulfəzl.

Havada morğan, gəzəndə pəran, Vuranda şəhpər Hüseynə ağlar,
Çəməndə lalə, gül üstə jalə, əsəndə sərsər Hüseynə ağlar,
Deyir firiştə, dəri behiştə çəkildi yeksər qara, Əbulfəzl.

## *Nöhə*

Gəlin əzizan, ürək olub qan, yenə Hüseynin əzası gəldi,
Hüseynə qurban, öləndə ətşan, başının üstə anası gəldi.

Gəl ey Hüseynçi,bir il deyərdin, Məhərrəm olsun,
Məhərrəm olsun.
Çəkildi ərşə Hüseyn qarası, əzayə qəlbin
müsəmməm olsun,
De ki, Hüseyn vay, qərib ağam vay, mənə əzada
qəm həmdəm olsun.
Ürəkdə dərdin kim etdi izhar, ona Hüseynin
dəvası gəldi.

Bu ayda yaran bəla çölündə,Əliyyi əkbər cihadə
getdi,
Verildi Zeynəb zəbihi-Zəhra qətil olunsun
minadə getdi,
Tapıb şəhadət o gün minadə, xiyamə cismi əbadə
getdi,
Hüseyn buyurdu deyin Anaya, xiyamə ziba
balası gəldi,

Bu ayda Qasım gedib cidalə, anası ağlar dalıyca
qaldı,
Töküldü ə`da araya aldı, çəməndə gül tək solub
saraldı,
Yetişdi dada ölən çağında, başın diz üstə əmisi
aldı,
Anası onun edəndə didar, qəmli ürəkdə nəvası
gəldi.

Bu ayda gördü susuzlar ağlar, gətirdi məşg və
liva Əbulfəzl,
Gedib Fəratə vurubdu pərçəm, susuz çıxıbdı ağa
Əbulfəzl,

Durubdu yolda gələndə ə`da görübdü qoldan yara Əbulfəzl,
Ürəkdə dərdin kim etdi izhar, ağam Əbulfəzl dərmanə gəldi.

Bu ayda şiə, susuzluğundan Əliyyi Əsğər dodağı yandı,
Gedib su alsın o gün ədudən, vuruldu peykan qana boyandı,
Süzüldü gözlər minadə qəmli, bala, qucaqda atan dolandı,
Bətule əthər açıbdı mə`cər, Hüseynə can-can sədası gəldi.

## *Cuşi*

Səs düşdü əhle- aləmə mahe əza gəldi,
Ey Kərbəla, amadə ol, şahe-hüda gəldi.

Mahi-Məhərrəmdir sənin dəştin olub gülşən,
Mənzil edib səndə Hüseyn, ey vadiyi-iymən,
Qoyma Fəratə əl tapa birəhm dövri-düşmən,
Bir karivan mehman sənə, ey Kərbəla gəldi.

Dəryayi-rəhmətdən çıxıb bir gövhəri-almas,
Hətta ola bilməz ona tay Xızrlan İlyas,
Zülmətə nur əfkən salub bədrüd-duca Əbbas,
Nəsrun minəllah pərçəmli sahib-liva gəldi.

Qoydu qədəm topraqına şahi-mülkü-leşkər,
Səyyareye-şəms və qəmər Qasım, Əliyyi-Əkbər,

Məhmildə banuyi-hərəm, gəhvarədə Əsğər,
Zəhra qızı Zeynəb kimi bir məhliqa gəldi.

Aydın deyim axır sənə, ey Kə`beyi sani,
Şam əhli ağlar qoymasın biçarə anani,
Qoyma gətirsin məqtələ Sə`d oğlu Zəhrani,
Cam əldə, bir üç yaşda qız dildə nəva gəldi.

Qoyma hərəmində sənin Şümr eyləsin tüğyan.
Tavusi-zərin, çətrlərin olmasın giryan,
Qoyma siphər izzətə səyyad ata peykan,
Şəhpər açıb gülzarına fövci hüma gəldi.

Tapdın məqamü mənzilət ey dəşti-mehmandar,
De kəsməsin qovmi əsəd yol üstə qurbanlar,
Yetmiş iki can verməyə gül üzlü qurban var,
Yasə batmış, həyatı qüssə-nəva gəldi.

Yaz Nadiri, aləm bu gün geymiş qara ağlar,
Əl qoltuğunda mərdo zən, şaho-gəda ağlar,
Güya Məhərrəmdir yenə ərzo-səma ağlar,
Sahibe-əzadır məclisə, xeyrun-nisa ağlar.

## *Sinəzən və cuşi*

## *İmam Zamana (ə.c) xitab*

Yenə quruldu cəddinə əzası, yəbnəl-Əsgəri!
Çəkildi ərşo-fərşidə qarası yəbnəl-Əsgəri!

Vuruldu zəngi tə`ziyət yetib xəbər Peyğmbərə,
Hüseyninin əzasıdır çəkildi qarə göylərə,

Asıldı qanlı köynəyi fəraze-ərşe davərə,
Qoyuldu göydə tə`ziyət binası, yəbnəl-Əsgəri!

Min üç yüz ildi ağlarıq yarasına dəva ola,
Deyillər bir yarsası var ona çətin şəfa ola,
Gərək sənin zühuruna gecə-gündüz dua ola,
Qalıb sənə ürəkdəki yarası yəbnəl-Əsgəri!

Hər il qara geyəndə biz xülus və etiqadilə,
Bir iddəyi-yəhud-xu baxır bizə inadilə,
Nə fərqi vardır Şümrilə Übeydibni-Ziyadilə,
Vurar bizə o kəslər dil yarası yəbnəl-Əsgəri!

Necə dayanmısan ağa, sükutü  helm o-səbridə,
Gəlibdi təngə Şiələr kəməndi-zülmo-cəbridə,
Qalıb Rübabın əlləri ürək başında qəbridə,
Zühurun eylər arzu duası yəbnəl-Əsgəri!

Eşitmişik çox ağlarsan həmişə sən bu mətləbə,
Sataşdı qızların gözü necə o qanlı mərkəbə,
Fəğan əz-zəlimədən yetirdi rəmzi Zeynəbə,
Ucaldı ərşə va Hüseyn sədası yəbnəl-Əsgəri!

Ucaltdı başdan əllərin o pakizad Heydəri,
Qabaqda şəhriyare-qəm, dalıyca düşdü, ləşkəri,
Görüb qara ləçəkləri əsibdi Şümrün əlləri
Salıbdı Şümri vəhşətə nidası, yəbnəl-Əsgəri!

Çağırdı yəbnə-zaniyə, əyuqtəlu rəcauna?
Ümidimizdi bu Hüseyn, dayan, eyvan xarab ola,
Nə Zeynəb etdi vahimə, nə Şümri qıldı e`tina,
Qalıb arada kuyi-həqq fədası, yəbnəl-Əsgəri!

Salıb təvan və tabdan Hüseyni şiddəti əməl,
Xiyamo-qətligahidə iki imam edibdi qəş,
Vücudi-höccətə görə xanım çox etdi keşməkeş,
Əlindən öpdü Fatimə-anası, yəbnəl-Əsgəri!

Görüb ki, Şümr baxmadı sızıltıyla tərənnümə,
Tutub zəbəski, qan gözün çətin gələ tərəhhümə,
Qaçıb əmiri-ləşkərin sorağına, təzəllumə
Ki bəlkə Şümrün əsgilə cəfası, yəbnəl-Əsgəri!

Yetişdi ibn Sə`dilə müqabil oldu rubəru,
Dedi Hüseyni öldürür bu Şümri-şum fitnəsi,
Müzayiqə gəl eyləmə üzündə olsa abiru
Məgər qoyardı başda Rey həvası, yəbnəl-Əsgəri!

Buyurdu heç yadında var babam Əli xilafəti,
Vuran zaman vücuduna hüdude şəri- zərbəti,
Çıxıb yadından ey əcəb Hüseynimin vəsatəti,
Deyib bu dərdə olmadı dəvası yəbnəl-Əsgəri!

Yetişdi onda bir nəfər şitabilə sərasimə,
Dilində əl-bəşarə və ürəkdə xovfu-vahimə,
Əmir müjdə ver tapıb Hüseynin əmri xatimə,
Pozuldu onda əmmənin nüması yəbnəl-Əsgəri!

Xanım qayıtdı məqtələ dübarə qəsdi-qürbətə,
Təvafi-nafi Kə`bəyə fəziləti-ziyarətə,
Öpüb kəsik boğazını gəlib kəmali-riqqətə,
Təkan verib Mədinəyə bükası, yəbnəl-Əsgəri!

Həmin Hüseyndi bu baba, anam çəkərdi nazını,
Sinəndə əyləşib sənə deyərdi hər niyazını,
Həmin Hüseyndi görmüşəm öpəndə sən
boğazını,
Dedi-dedi ucaldı hey nəvası, yəbnəl-Əsgəri!

Cavab gəldi Zeynəbə çox eyləmə fəğan, bala,
Gərək bu qan belə qala, gələ o qan alan, bala,
Gətirdi şurə Zeynəbi bu söz, çağırdı can bala,
Hayandasan Hüseynimin balası, yəbnəl-Əsgəri!

## *Qundaqı ərşə gedən (cuş)*

Qundaq ilə ərşə zinətdir Hüseyn, həşridə babi-
şəfaətdir Hüseyn!
Sərvəri-azad mərdani-cahan milləti dünyaya
izzətdir Hüseyn!
Qəlbidə gizli məhəbbətdir Hüseyn, xəlqə
misbahi-hidayətdir Hüseyn!
Mayəyi-ənduh və möhnətdir Hüseyn, sayeye-lütf
və inayətdir Hüseyn!
Payəyi-ədl və şəfaətdir Hüseyn, hər əməldə şərti-
sihhətdir Hüseyn!
Rəmzi-rəhmət, ruhi taətdir Hüseyn, bəhri-cud,
əbri səxavətdir Hüseyn
Şahi-iqlim səadətdir Hüseyn, mahi-əflak
fütüvvətdir Hüseyn!
Meyvəyi-nəxli nübüvvətdir Hüseyn, şirəyi-
bustani-ismətdir Hüseyn!
Buyi-ətri-bağı-cənnətdir Hüseyn, cuyi- nəhri-
şəhri qüdrətdir Hüseyn!

Mərdi-meydani-şücaətdir Hüseyn, fərdi divani fəsahətdir Hüseyn!
Şe`ri-pur şuri-lətafətdir Hüseyn, nəsri mənsuri-bəlağətdir Hüseyn!
Tərhi-bəzmi-arayi-möhnətdir Hüseyn, şərhi-ənduh və müsibətdir Hüseyn!
Mehri-rəxşani-vilayətdir Hüseyn, çehryi-zibayi-imamətdir Hüseyn!
Şafei-ruzi-qiyamətdir Hüseyn, dafii-üsyani-ümmətdir Hüseyn!
Ruzi-məhşər Allah əmri ilə yəqin, mayei-əfvo-şəfaətdir Hüseyn!

*  *  *  *  *  *

Hər kəs ola sidq ilə əzadarı Hüseynin,
Məhşərdə bağışlar onu Qəffarı Hüseynin.
Lütf eylə Xuda, bağlı qalan yollar açılsın,
Bir vəqfe ola şövq ilə əzadarı Hüseynin.

Əl çəkmərəm ömrümdə Hüseynin ətəyindən,
Olam del və canilə fədakarı Hüseynin,
Məcnun səgi-Leylinin öpərdi ayağından,
İzzətlidi həqqa, səgi-dərbarı Hüseynin.

## *Kərbəlada imtahan verəm*

Bu yerdə mən gərək bacı bəlaya imtahan verəm,
Özüm, köməklərim susuz bu çöldə təşnə can
verəm.

Bu yer o yerdi daima həqiqətin binasi var,
Bu yer o yerdi Zeynəbin həvası yox,bəlası var,
Bu yer o yerdi zahirən ki, qorxulu havası var,
Nihali-dinə burda mən gərəkdi təşnə can verəm.

Bu yer o yerdi doğranar mənim hamı
köməklərim,
Bu yerdə çulğanar qana, bacı, yəqindi Əkbərim,
Əlimdə çırpınar ölər, boğazı qanlı Əsğərim
Bu dinə Xaliq istəyib uşaq verəm, cavan verəm.

Bu çöldə əşqiya vurar şərər yanar bu xeymələr,
Qaçar Səkinə çöllərdə susuz qalar, yanar,mələr,
Bu yerdə tiri-zəhrigin ürək başın yarar, dələr,
Bu sinəm üstə oxlara rəvadı mən məkan verəm.

Bu yer o yerdi Xaliqə Hüseyninin niyazı var,
O qətligahidə açar ki, qanlı canamazı var,
Vüzusu qüslü qan olar, o qan ilə namazı var,
O qan ilə namaz ilə cahanı mən təkan verəm.

Bəlalı yer mənimkidir, bəlaya aşiqəm özüm,
Sinəmdə at çapar qoşun, yaraya aşiqəm özüm,
Sözüm qanım həqiqidir Xudaya aşiqəm özüm,

Bu qanilə ədaləti səzadi mən neşan verəm

Üzüm yaralı qiblədə ibadət aşinasiyam,
Vəleyk əbdi-həqq mənəm, itaət aşinasiyəm,
Şəhidi-rahi-vəhdətəm, şəhadət aşinasiyam,
Gərəkdi məndə eşqilə şəhidi-cavidan verəm.

Şəriki-nehzətik bacı, verək mənilə əl ələ,
Bu din yolunda qan verəm, ürək bu yerdə dincələ,
Qoşun həyalı qızları, bacı, çəkəndə məqtələ,
Gedəndə Kufəyə gərək dalızca mən azan verəm.

Başlanıb əza Hüseynə

Görsənib hilali-matəm, başlanıb əza Hüseynə,
Baş açıb Rəsuli-əkrəm, ağlar ənbiya Hüseynə.

Doldurub cahanı şivəni, masəva batıb məlalə,
Ovc edibdi taqə ərşi-fərşidən fəğan və nalə,
Əyləşib qübari-möhnət barigahi-zül-cəlalə,
Nohə fələkdən eyliyiblər bəzmi-qəm bina Hüseynə.

Baş açıb gəlib nəvaya bağıcənnət içrə Zəhra,
Həmsəda olub Bətulə Məryəm və Xədicə, Həvva,
Fərş olub bəsati-matəm, bəzmi-şəm olub mühəyya,
Ölməmiş əza tutublar şahi-Kərbəla Hüseynə.

Namələr yazıb bu ayda Kufiyani bi mürüvvət,
Etdilər şəhi hicazı dəşti-Kərbəlayə də`vət,
Bağlayıb rəhi-Fəratı qaldı təşnə Ali-ismət,

Babi-cövr və zülm açıldı sibti-Mustəfa Hüseynə.

Zülmilə əl üzdü Ovn və Fəzl və Cəfərindən,
Yadigari Müctəbadan mahi-parə Əkbərindən,
Dini-həqq yolunda keçdi şiri-xarə Əsğərindən,
Ağladı o gündə yeksər qovmi-əşqiya Hüseynə.

Kəsdilər susuz qəfadan vurdular başın cidayə,
Baş açıb anası cəddi gəldi dəşti-Kərbəlayə,
Va Hüseyn səsi ucaldı taqi-ərşi-kibriyayə,
Qətligahda oldu bərpa məclisi əza Hüseynə.

## *Kərb və bəla kəlməsinin tə`vili*

Kərbəla bir kəlmədir, amma iki mə`nası var,
Qəm-bəla ilə mürəkkəb kəlmə bir əzası var.

Kərb bir mə`nası qəm, yə`ni o səhranın qəmi,
Cəm o səhraya olubdur kulli-dünyanın qəmi,
Külli-dünyanın qəmi fərzəndi-Zəhranın qəmi,
Bu qiyasolmaz Hüseynin möhnəti-üzması var.

Sikkə qan Kərbəla bazarının simuzəri,
Qəm-bəladan qeyri yoxdur bir mətai-digəri,
Bir hicazın padişahıdır Hüseyn sövdagəri,
Nəqd-can əldə gəlib Allah ilə sövdası var.

Kərbəla yə`ni o yerdir cəm olubdur hər bəla,
Var cahanda hər qədər qəm hərçe sərtasər bəla,
İttihad eyliyib qəmilə adı qalmış Kərbəla,
Orda qəmlər şurişi,orda bəla sövdası var,

Kəlmənin var altı hərfi, misli-helm və səbridir,
Səbr və helmin sahibi ol altıguşə qəbridir,
Bəs niyə hər göz görür ol qəbri misli- əbridir,
Çünki, əbrin barişi eşqi-çəmənarası var.

Altı hərfi eyləsən tə`vil,var mənası çox,
Şərh olunsun nəzmilə bir bəndidə imkanı yox,
Kaf ibarət kargər bir yarədir üç şöbə ox,
Qəlbilə aya oxun heç bir gərərun yarası var.

Ra ibarətdir rəiyyət misli dərya etdi cuş,
Aldılar şahı araya eylədilər nizə puş,
Bir nəfər məzrubi zarib yüzmin ə`da eylə guş,
Vay mənə, hardan Hüseynin saf qalan ə`zası
var?!

Ba əvvəl, başını Şümri-dəğa ol kəsib,
Bai-sani xırdaca barmağını Bəcdəl kəsib,
Gördü üryan, yox libası,saribanı əl kəsib,
Nə`şi üç gün qaldı yerdə ayrı tur inşası var.

Lam lazımdır deyilsin can veribləblər susuz,
Zibh olub həncər susuz, zibh eyləyib xəncər
susuz,
Əlif ibarətdir olub Əkbər susuz, Əsğər susuz,
Qəhti-ab oldu o səhrada ki, süd riyası var.

Altı hissə oldu nə`şi, birbəbir oldu bəyan,
Şimr apardı başını, bir cüft əlini sariban,
Bəcdəl öz səhmiyəsin beş müncisin fərz eylə qan,
Altıncı nə`şidir qudalidə süknası var.

Altı qismət bir bədəndən qarət oldu camәsi,
Getdi nə`leyni ayaqdan, başidən əmmaməsi,
Bir əbadır bir üzük, bir pirahən bərnaməsi,
Bir də İran yadigarı adı Nuh iması var.

Altısı mahi-məhərrəmdən olundu səddi- ab,
Altı aylıq südəmər oğlu susuzdan del kəbab,
Altı qardaşlar qəmi qəlbində ol alicənab,
Altı yandan üstünə qəm fovcunun peydası var.

Altı sərkərdə edib bu iddianı həmnəfəs,
Mən şəhid etdim bu məzlumu nəinki qeyri-kəs,
Şümr və xuli hərmələ kə`b və sinan ibn Ənəs,
Qatili-Əkbər deyər qatil mənəm də`vası var.

Başını zibh etmişəm Şümr ibn Zil-covşən deyir,
Taqətin nizə ilə mən aldım Sinan rovşən deyir,
Hərmələ üçşöbə ox qəlbinə vurdum mən, deyir,
Xulinin əldə olan tək mədrəki balası var.

Müztərrə tofiq əta et, ey Xudayi-ləm yəzəl,
Nitqini guya sözün şirin elə misli əsəl,
Daməni-pak Hüseyndən çəkməyibdir, çəkməz əl,
Ta nə qədri canı var, əldə qələm qirtası var,

## *Bacı Zeynəb*

Mə`nada bu yer ərşi-Xudadır, bacı Zeynəb,
Səbr eylə dayan, Kərbübəladır, bacı Zeynəb.

Yoxdur bu yerin şə`ninə dünyada çatan yer,
Olmaz belə bir şöhrəti afaqı tutan yer,
Buyurdu bacı, qafiləyi-eşqi yatan yer,
Aramgəhi-əhli-vəfadır, bacı Zeynəb.

Girəm ki, Mədinə mənim əsli vətənimdir,
Mihəndi mənə gülşəno bağ və çəmənimdir,
Bu Kərbübəla aləmi-xilqətdə mənimdi,
Ayinəyi-mişkati-hüdadır, bacı Zeynəb.

Mən saliki-eşqəm buradır məktəbi-irfan,
Bu yerdə gərək əhdi-ələstu tapa payan,
Şayəstədi bu mənzilə yetmiş iki qurban,
Üşşaqə bu yer kuhi-Minadır, bacı Zeynəb.

Bu yerdə tiri-hasil mənzuri-Hüseyni,
Mehr və mehi heyrətdə qoyan nuri-Hüseyni,
Bir xatirədir ləylətul-aşiri Hüseyni,
Ənsari-Hüseyn burda fədadır, bacı Zeynəb.

Məhbubi-Xuda bəstəyi-hübbül vətən olmaz,
Dildarı tapan mayili seyri-çəmən olmaz,
Aşiq qoyan öz adını peyman şekən olmaz,
Əhdimdə qüsur olsa xətadır bacı Zeynəb.

Eşq aləmidi verməərəm əfkarimə təğyir,
Qur`anə gərək burda  yazam qan ilə təfsir,
Xoşdur ürəyimdən dəyə üç şö`bəli bir tir,
Bilsinlər Hüseyn dinə fədadır, bacı Zeynəb.

Haşa qəm və ənduhidən etsin giley aşiq,
Şəmşir ilə doğransa edər hövsələ aşiq,
Atdan üzü üstə yıxılar məqtələ aşiq,
Nifrin yerinə zikri duadır, bacı Zeynəb.

Düşmən əlimi burda üzər hər kömyəindən,
Bir ox dəyər axır nəfəsimdə ürəyimdən,
Zəhra baş açar qan süzüləndə kürəyimdən,
Aləm mənə məşğuli-əzadır, bacı Zeynəb.

Təsmim tutub ümdə budur fikri Yezidin,
Nehzət eləyib ziddinə Qur`ani-məcidin,
Məhv eylərəm asarını yeksər o pəlidin,
Din üstə Hüseyn ölsə rəvadər, bacı Zeynəb.

Mən kuştey-eşqəm deyiləm məsti-riyasət,
Biganə edəmməz mənim əmrimdə dəxalət,
Ta var nəfəsim eylərəm İslamı himayət,
Allah da bu təsmimə rizadır, bacı Zeynəb.

Nə əhli-xərabat və nə meyxanə pərəstəm,
Nə naqizi-peyman və nə peymanə pərəstəm,
Nə xain və qəddar və nə biganə pərəstəm,
Əvvəldən Hüseyn əhli-viladır, bacı Zeynəb.

Mən saxlaram İslami bu küffar arasında,
Təbliğ edərəm dinimi əşrar arasında,

Tənzilləri ba rəsm ola bazar arasında,
Səbr etsə Hüseyn dinə cəfadır, bacı Zeynəb.

Sən də mən ilə şirkət elə rahi-vəfada,
Səbr eylə fişari-qəm və ənduh və bəlada,
İslam adını zində edək Kərbubəlada,
Bu dinə fəda Ali-əbadır, bacı Zeynəb.

Qanım bu qara torpağı lə`li-gohər eylər,
Zəvvarı həmin torpağı kühli bəsər eylər,
Bu toprağı şahlar özünə taci sər eylər,
Bimarlərə xaki-şəfadır, bacı Zeynəb.

Bu yerdə batar qanına övladi-Peyəmbər,
Su üstə verər qolların Əbbasi-dilavər,
Ləbteşnə verər can yaralı Qasim və Əkbər,
Əsğər hədəfi tiri-bəladır, bacı Zeynəb.

Bu yerdə axar qan yaralardan su yerinə,
Bu yerdə susuzdan saralar nazlı Səkinə,
Bu yerdə soyar qızlarımı ləşkəri-Kinə,
Əflakə çaxan-şuru-nəvadır, bacı Zeynəb.

Bu yerdə alar dövrəmi qəm dəstə-bədəstə,
Əsğər susuzundan çabalar əllərim üstə,
Haşa o cəfalar edə əfkarımı xəstə,
Gəldikcə bəla qəlbə səfadır, bacı Zeynəb.

Eylərlər təbərrük bu yerin gərdü-qübarın,
Bir dəridi hər bisərü pa bilməz əyarın,
Bu yerdi Kəriminin alan səbr və qərarın,
Daim sözü ya Kərbubəladır, bacı Zeynəb.

## *Mən hara Kərbəla hara*

Dildə deyərdim ey Xuda, mən hara Kərbəla hara,
Ülfəti-şahi ba gəda, mən hara Kərbəla hara?

Kərbubəla ki türbəti xaki şəfayi-şiədir,
Torpağı səngrizəsi lə`l və təlayi-şiədir,
Beyni-hərəm ila hərəm mərvo səfayi- şiədir,
Nəhri Fəratının suyu abi bəqayi-şiədir,
Kisəyi-binəva hara, göhəri-şəbnüma hara?
Mən hara Kərbəla hara?

Kərbübəla qələmru şahi-sərir eşqidir,
Mə`bədi-əhli-mərifət məsnədi piri eşqidir,
Xaki-əmir eşqidi kaxi vəzir eşqidir,
Minlər əziz misrilər orda əsir eşqidi,
Xaki-şərifi-kimiya, mən hara Kərbəla hara?
Mən hara Kərbəla hara?

Kərbubəladı Fatimə güllərinin solan yeri,
Zeynəb əzizi itrətin saçlarını yolan yeri,
Xeymələrin talan yeri qızlar əsir olan yeri,
Düşmənin ali-ismətə gözlərinin dolan yeri,
Ordadır şəhri-mən bəka mən hara Kərbəla hara?
Mən hara Kərbəla hara?

Mən üzü qarə bir gəda babi-ətayə gəlmişəm,
Mənbəi lütfü-mərhəmət cud və səxayə gəlmişəm,

Dildə Hüseyn, Hüseyn deyib Kərbübəlayə gəlmişəm,
Qəbrinə qurbanam ağa mən hara Kərbəla hara?
Mən hara Kərbəla hara

Kərbübəla ki, Zeynəbin orda əza məhəlli var,
Zeynəb adıyla adlanan yaxşı səfalı təlli var,
Turdə bir kəlim olur təllidə əlli-əlli var,
Orda yanan ürəklərə müalicə,təsəlli var,
Səs gəlir orda ya əxa, mən hara Kərbəla hara?
Mən hara Kərbəla hara?

Saldı əcəb məhəbbətin dərdo-bəlaya Zeynəbi,
Eşqi çəkib Mədinədən Kərbübəlaya Zeynəbi,
Naz ilə harda bəslədi gətdi haraya Zeynəbi,
Saldı Hüseyn deyə-deyə əynə əxayə Zeynəbi,
Məryəmi ali-Mustəfa, mən hara Kərbəla hara?
Mən hara Kərbəla hara?

Yerdə sürünmə bağrıqan, səbr elə gəlmə, mən gəlim,
Xəstə susuz yaralısan, səbr elə gəlmə mən gəlim,
Xeymədən olma nagiran, səbr elə gəlmə mən gəlim,
Vermir bu düşmənim aman, səbr elə gəlmə, mən gəlim,
Dövrəni almış əşqiya, mən hara Kərbəla hara?
Mən hara Kərbəla hara?

Xeymələr od tutub yanır, qoymaram itrətin yana,
Bir-bir alıb qucağıma qızları çəkmişəm yana,
Gahi xiyamə qaçmışam, gahi o qanlı meydana,

Bax mənə doymuşam cana, əl-ayağım batıb qana,
Bir belə macəra hara, mən hara Kərbəla hara?
Mən hara Kərbəla hara?

Fatimə yadigarı, başı bəlalı Zeynəbəm,
Ney kimi nalə eyələrəm, şuru-nəvalı Zeynəbəm,
Yaslı əzalı Zeynəbəm, başı qaralı Zeynəbəm,
Əbtəhiyəm, Hicaziyəm Kərbübəlalı Zeynəbəm,
Hər qəmə olmuşam riza, mən hara Kərbəla hara?
Mən hara Kərbəla hara?

Zeynəbəm, ali-ismətin ismətiyəm həyalıyam,
Nuri-du çeşmi-Heydərəm, Fatimənin maralıyam,
Yeddi bəradərim ölüb, qüssəliyəm əzalıyam,
Qana batıb iki balam, dağlı ürək yaralıyam,
Sən hara Neynəva hara mən hara Kərbəla hara?
Mən hara Kərbəla hara?

Adət olub Kərimiyə ağlaya," Ya Hüseyn!" deyə,
Hər Səfəri Məhərrəmi sinə vura,qara geyə,

Eşqo-səfası nohədi, şuri-nəvasi mərsiyə,
Bir də nəsibim olsa gər çıxsam o Zeynəbiyəyə,
Səslərəm eşqə mərhəba, mən hara Kərbəla hara?
Mən hara Kərbəla hara?

## *Ya Hüseyn,vay Hüseyn!*

Ya Hüseyn, ya Hüseyn, ya Hüseyn, ya Hüseyn!
Naümid eyləmə səni Zəhra, Hüseyn!
Əlimiz boşdu, üzümüz qara
Qapına gəldik edəsən çara.

Möhnətin od salıb ürəyim başına,
Bir gümanım gəlir gözümün yaşına,
Adını yazdırram qəbrimin daşına,
Olma razı qalam onda tənha, Hüseyn.
Adına xatir, gələsən mövla,
Gözümün yaşın siləsən mövla.
Əlimiz boşdu, üzümüz qara,
Qapına gəldik edəsən çara.

Kim gəlib ağlasa iki qətrə sənə,
Yazılar dəftərə iki yüz həsənə,
Hamı lənət edər əlini kəsənə,
Niyə kəsdi əlin sənin ə`da, Hüseyn.
Yıxılıb Zəhra - bədəni əsdi,
Əl açıb zalım əlini kəsdi,
Əlimiz boşdu, üzümüz qara,
Qapına gəldik edəsən çara.

Qurbanam ağacan kəsilən biləyə,
Əzilən sinəyə,üzülən ürəyə,
Tökülən, qanına,sökülən kürəyə,
Qətligahı edən turi- sina,Hüseyn!
Yalvarar Zeynəb - qulaq asmazlar,
Yaralı nə`şi daşa basmazlar,
Əlimiz boşdu, üzümüz qara,

Qapına gəldik   edəsən çara.

Necə yaddan çıxar quruyan boğazın,
Laxta qan içində qanlı dəstəmazın,
Namazı dirildib axirin namazın,
Yaralı müsəlli, qan müsəlla Hüseyn!
Qanlı daşlar var canamazında ,
Mat olub aləm o namazında,
Əlimiz boşdu,   üzümüz qara,
Qapına gəldik   edəsən çara.

Qardaşı yıxılıb nəhri-Əlqəm üstə,
Bacısı ağlasın hansı matəm üstə,
Qan axır qan üstə, qəm gəlir qəm üstə,
Təllidən Zeynəbi səslənir va Hüseyn!
Dağılıb quşlar alışıb lanə,
Sıxılıb qızlar hərə bir yanə,
Əlimiz boşdu, üzümüz qara,
Qapına gəldik edəsən çara.

Təllidən baxardı bacı qardaşına,
Xuni-del qatardı gözdə göz yaşına,
Düşdü nagəh gözü nizənin başına,
Eyləyib nizəni nəxli-tuba Hüseyn!
Eşqi sabitdi əhdo-peymanda,
Baş cida üstə,nəşi meydanda,
Əlimiz boşdu,üzümüz qara,
Qapına gəldik edəsən çara.

Ey Kərimi, əl aç şahi-möhtəşəmə,
Bağla kəşkülüvi dərgəhi-kərəmə,
Hacı Yəqubla o gözəl hərəmə,

Yaza bir dəvəti edə imza Hüseyn!
Bizi bir vəqfə qoşa züvvara,
Ağlayaq şahə gəhi, ələmdara,
Əlimiz boşdu,üzümüz qara,
Qapına gəldik edəsən çara.

Ağacan nə olar cuş edə kərəmin,
Bizə qismət ola o gözəl hərəmin,
Alaram çiynimə o yatan ələmin,
Vuraram başıma, deyərəm ya Hüseyn!
Kərbəla adı mənə əzbərdir,
Hədəfim eşqim Əliəkbərdir,
Əlimiz boşdu,üzümüz qara,
Qapına gəldik edəsən çara.

## *Təşt qoymaq*

Quruldu təşti-qəm əsası, şiə,
Yaxınlaşıb Hüseyn əzası şiə.

Hüseynə təkyələrdə pərçəm ağlar,
Su teştdə baxar, dəma-dəm ağlar,
Fərat axar, Fərata Zəmzəm ağlar,
Gəhi əyninə Hüseyn qarası,şiə.

Hüseynə baş açıb Peyğəmbər ağlar,
Rəvaqe-ərşidə mələklər ağlar,
Hüseynə məscid ilə minbər ağlar,
Hüseyndi aləmin ağası,şiə.

Bu teşti- qəm əlaməti əzadır,
Südabədən əsəfli macəradır,
Hüseyn xəlili-dəşti-Kərbəladır,
Yaxındı məhşər və minası şiə.

Hüseyni saxlayanmadı Mədinə,
Rəvan edib bəlalı sərzəminə,
Xoş aməd etdi Kərbəla Hüseynə,
Hüseyndi Kərbəla fədası şiə.

Hüseyn qədəm qoyanda Neynəvaya,
Fələkdə kəhkəşan gəlib nəvaya,
Xəbər veriblər xəyritün-nisaya,
Batıb qəmə oğul anası, şiə.

Yəzidin yazıb Vəlidə namə,
Yetişsin əxz beyətlə kamə,
Hüseyn dedi baş əymərəm qulamə,
Hüseyndi qəmlər aşinası,şiə.

Hüseynçi ziri- bari-zülmə getməz,
Hüseynçi zalıma itaət etməz,
Xəbis əli müqəddəsatə yetməz,
Budur Hüseynin iddiası,şiə.

Gözəldi təştidə suyun səfası,
Qulaq verin gəlir həzin sədası,
Baxır əmiyə qardaşın balası,
Məgər edir su iltiması, şiə?

Ciyərlərim yanır, əmi, amandı,
Özüm də, yandım Əsğərim də, yandı,
Sədayi-əl-ətəş güya dayandı,
Dayanma qulların fədası, şiə.

Fərata çatmaq çətin yol oldu,
Qələm su xatirinə sağ- sol oldu,
Su qiyməti iki uzun qol oldu,
Yıxıldı ceyşi-din ləvası, şiə.

Açıldı məclisi əza Əbəlfəzl
Özün köməkl elə, ya Əbulfəzl,
Ola vəzifəmiz əda, Əbulfəzl,
Edər özündən iltiması, şiə.

Kərimi, yoxdu möhlətin əcəldən,
Vəleyk dəst xalisən əməldən,
Bu qanlı daməni ötürmə əldən,
Hüseyndi dərdinin dəvası, şiə.

## *Təşt qoymaq*

## *(Sinəzən)*

Mahi-Məhərrəm oldu saxla əza Hüseynə,
Ərşə çəkildi qarə, ağlar səma Hüseynə,
Vur sinənə sızılda elə, nəva Hüseynə,
Va qürbəta Hüseynə, va həsrəta Hüseynə,
Ruhum fəda Hüseynə, canım fəda Hüseynə,
Cismim fəda Hüseynə, canım fəda Hüseynə.

Ağlar gözüm Hüseynə, cəddi Peyəmbər ağlar,
Bərpa edibdi məhşər, xatuni məhşər ağlar,
Ətşan ölən Hüseynə saqiyye-kövsər ağlar,
Mə`nadə indi ağlar qan Kərbəla Hüseynə,
Ruhum fəda Hüseynə, canım fəda Hüseynə,
Cismim fəda Hüseynə, canım fəda Hüseynə.

Mahi-əza yetişdi, təşti əza quruldu,
Həsrətlə təkyələrdə qarə ələm vuruldu,
Yə`ni suyun bəhası bu ayda başdı, qoldu,
Göylər olubdu guya matəmsəra Hüseynə,
Ruhum fəda Hüseynə, canım fəda Hüseynə,
Cismim fəda Hüseynə, canım fəda Hüseynə.

Qana dönəydin ey su, məşk oxlanan zamanda,
Səqqayi-Kərbəlanın qəlbi yanan zamanda,
Ahən əmudun altda başı sınan zamanda
Həsrətlə səsləndi ədrik əxa, Hüseynə
Ruhum fəda Hüseynə, canım fəda Hüseynə,
Cismim fəda Hüseynə, canım fəda Hüseynə.

Qana dönyədin ey su, səqqa sənə baxanda,
Tufan qopanda oxlar çun ildırım çaxanda,
Əbbas gözlərindən əşkilə xun axanda,
Ərvah səslənəndə ya ləytəna Hüseynə,
Ruhum fəda Hüseynə, canım fəda Hüseynə,
Cismim fəda Hüseynə, canım fəda Hüseynə.

Bir iddə ox, bir iddə pərtab ediblər səngi,
Əbbasa təng ediblər ləşkər fəzayi-cəngi,
Möhkəm tutub ayağın rədd etmədi üzəngi,
Səsləndi vay, oğul vay xəyrun nisa Hüseynə,

Ruhum fəda Hüseynə, canım fəda Hüseynə,
Cismim fəda Hüseynə, canım fəda Hüseynə.

Baş sındı, mərkəb üstdən sahibi ələm yıxıldı,
Yeksər bədən yaralı, qollar qələm yıxıldı,
Həm baxdı xeyməgahə, həm yandı həm yıxıldı,
Həm Müstəfa təsəlli, həm Mürtəza Hüseynə,
Ruhum fəda Hüseynə, canım fəda Hüseynə,
Cismim fəda Hüseynə, canım fəda Hüseynə.

Aldı o namdarı cəlladlar araya,
Daşlar gəlir daş üstə, yara dəyir yaraya,
Kimdir deyə Nəcəfdə bu halı Mürtəzayə,
Gəl ya Əli həraya eylə dua Hüseynə,
Ruhum fəda Hüseynə, canım fəda Hüseynə,
Cismim fəda Hüseynə,canım fəda Hüseynə.

Həmlə edərdi leşkər bir miri-leşkər üstə,
On yeddi qanlı xəncər bir təşnə həncər üstə,
Çox qalmadı tökülsün göylər bu yerlər üstə,
Ağlar səfa və mərvə Məkkə-Mina Hüseynə,
Ruhum fəda Hüseynə, canım fəda Hüseynə,
Cismim fəda Hüseynə, canım fəda Hüseynə.

Nəhri-Fərat utandı səsləndi va Əbulfəzl,
Səndən xəcalət oldum, əfv eylə ya Əbulfəzl,
Axdıqca mövcə gəldim, etdim həya Əbulfəzl,
Təhrim edib fəratı bu əşqiya Hüseynə,
Ruhum fəda Hüseynə, canım fəda Hüseynə,
Cismim fəda Hüseynə, canım fəda Hüseynə.

Əbbasa aləm ağlar, Həvva və Adəm ağlar,
Musa dəmadəm ağlar, İsa ibn Məryəm ağlar,
Beytü Mina və məş`ər Əbbasa zəmzəm ağlar,
Ərzi-təsəlli eylər Mərvo-Səfa Hüseynə,
Ruhum fəda Hüseynə, canım fəda Hüseynə,
Cismim fəda Hüseynə, canım fəda Hüseynə.

Nohə yazar Kərimi ta nitqi var, bəyan var,
Ta peykərində can var, ta rəglərində qan var,
Sinə vurar sızıldar ta taqət və təvan var,
Ağlar deyəndə nohə sübh o məsa Hüseynər,
Ruhum fəda Hüseynə, canım fəda Hüseynə,
Cismim fəda Hüseynə, canım fəda Hüseynə.

## *Kərbəlaya vurud*

## *(Sinəzən)*

Zeynəb yetib qatarın əqtari-Kərbəlaya,
Ol baxəbər sərasər əğyari-Kərbəlaya.
Cəddim Rəsuli əkrəm etmiş məni xəbərdar,
Eylər məni bu çöldə məzlumi-qövmi-əşrar,
Ol hər qəmə müsəmməm, ey mən qəribə qəmxar,
Dildarılıq verərsən dildari-Kərbəlaya.

Bir qəbri-altı güşə verrəm bu çöldə təşkil,
Ərşi-Xuda şərəfdə eylər bu qəbrə təclil,
Səhno-rəvaq və günbəz həm çilçıraq və qəndil,
Eylər xəlil qibtə me`mari Kərbəlaya.

Aşiq xətadı qatsın hər eşqi eşqi-safa,

Qafildi dəstəmazı caiz bilən muzafa,
Yusif deyil satılsın bazaridə kəlama,
Əkbər gətirmişəm mən bazari-Kərbəlaya.

Zeynəb, bu Kərbəladı, layiq bəlayi-eşqə,
İbrahimə xəbər gəlsin, minayi-eşqə,
Baxsın fədayi-eşqə səyi səfayi-eşqə,
Hacirdə yox təhəmmül əsrari-Kərbəlaya.

Aşiq şərar eşqə yandıqca dil doyanmaz,
Pərvanə tək yananda nə ağlamaz, nə dinməz,
Ya nari kuni bərdən fərmaninə sevinməz,
Mən tək təhəmmül eylər azari-Kərbəlaya.

Bu dəşti-Kərbəlanı xoş gülüstan edəm məni,
Yox bəlkə mənzilətdə baği-cinan edəm mən,
Zəvvarə neynəvanı kəhfi-əman edəm mən,
Firdovsi,rəşk apar sən bülvari-Kərbəlay.

Qurbanlığa Minada şahzadə Əkbərim var,
Məhi-parə Qasimim var, şeşmahə Əsğərim var,
Nəhri-Əlqəm üstə səqqa sərdari-leşkərim var,
Qan su yerinə versin gülzari Kərbəlaya.

Nazlı bacım az ağla, var ağlamaq zamanı,
Görsən əlim əlində məqtəldə saribanı,
Zəhra anamla bahəm başla bacı fəşanı,
Yaz əşkilə ünvan tumari-Kərbəlaya.

Şimr ilə mö`cüz üstə dərgir olanda ağla,
Barmaqlarım düçari şəmşir olanda ağla,
Zeynül-ibad əsiri-zəncir olanda ağla,

Ağla himayət eylə bimari-Kərbəlaya.

Badi-xəzan əsəndə, güllər solanda ağla,
Zəhra baxışlı gözlər qanla dolanda ağla,
Qızlar cənazəm üstə zülfün yolanda ağla,
Əşkinlə ver təsəlli salari-Kərbəlaya.

Gülzarına xəzandan yellər əsəndə ağla,
Qatil susuz Hüseynin başın kəsəndə ağla,
Cəddim atam anam da ağlallar, sən də ağla,
Nohə edib səsin qat zəvvari-Kərbəlaya.

E`lan edər Kərimi Əqvam və aşnaya,
Mülhəqq olun əzizan, zəvvari Neynəvaya,
Yollar açıldı qoyma fürsət gedə fənaya,
Amadə olsun ellər didari-Kərbəlaya.

## *İmam Hüseynin (ə) zəbani- halı*

Qədəmin mübarək olsun, bura Kərbəladı Zeynəb,
Bu çölün havası qəmdir,qəmə mübtəladı Zeynəb.

Olacaq məqamı şayan, gələr əhli-razo-taət,
Edər altıguşə qəbri hamı eşqilə ziyarət,
Ola kim o qəbrə zair tapacaq rəhi-şəfaət,
Necə türbəti müəttər,səbəbi şəfadı Zeynəb.

Bacı, bu diyari qəmdə neçə gün qonaq qalarsan,
Deli-şəbdə oxşayanda anamın səsin alarsan
Bilirəm bu çöldə axır başına qara salarsan,
Gecələr bu çöldə Zəhra sənə həmnəvadı, Zeynəb.

Bizə bağlayar bu düşmən su yanında rahi-carə,
Suya azim ollam onda qucağımda mahi-parə,
Gələ bilmərəm xiyamə ox dəyəndə şiri-xarə,
O gün Əsğərin boğazı oxa aşinadı,Zeynəb.

Anası əgərçe gözlər balanın yolun xeymədə,
Qəm əli ürək başında tıbo-tab və piçü xəmdə,
Balasın yaralı görsə yeri var yana bu qəmdə,
Mənə ümdə müşkül onda ox əmən hümadı,
Zeynəb.

Solacaq mənim baharım, bacı sən xəzana səbr et,
Sərnizə üstə başım gələcək bəyana səbr et,
Yazılıb sənə risalət, qəmi-bikərana səbr et,
Deyər əhli aləm sənə mərhəbadı Zeynəb.

## *Zeynəbin zəban hali (nohə)*

Özün gəl Kərbəlaya ya Mühəmməd (s)!
Düşüb Zeynəb bəlaya ya Mühəmməd (s)!

Qiyamətdir bu gün Kərbü-bəlada,
Hüseynin peykəri qalmış arada,
Əli başda qaçır Zeynəb piyada,
Əqəllən gəl əzaya, ya Mühəmməd (s)!

Əliyyu-Əkbərim qanə batıbdır,
Əliyyu- Əsğərim ətşan yatıbdır,
Bu dünyanın qəmin gözdən atıbdır,
Gəlib yer-göy nəvaya, ya Mühəmməd (s)!

Bu çöldə təşnələb ənsarım öldü,
Köməksiz qalmışam qəmxarım öldü,
Ucaboy qəhrəman sərdarım öldü,
Çıxar naləm səmaya, ya Mühəmməd (s)!

Bu çöldə şir-xarım oxlanıbdır,
Cavanlarım sitəmlə doğranıbdır,
Təmamən xeyməgahım odlanıbdır,
Xəbər ver Mürtəzaya, ya Mühəmməd (s)!

Mənim tək bir bacı gəlməz cəhana,
Ölüb qardaşlarım gəlsən fəğana,
Bizi gözdən necə saldı zəmana,
Gəlib yer-göy nəvaya, ya Mühəmməd (s)

## *Aşura gecəsi*

Xeymələrdə qurulub məhşəri-kübra bu gecə,
Əli qoynunda gəzir həzrəti-Zəhra bu gecə.

Yarü ənsari-Hüseyn razü niyaz üstədilər,
Bu gecə möhlət axirdi namaz üstədilər,
Vəsl vəqti yetişib suzi-güdaz üstədilər,
Bəzmi-yarə hamısı oldu muhəyya bu gecə,

Ucalıb noh fələkə naleyi-tiflan Hüseyn,
Zeynəbi etdi qəmin söhbət-hicran-Hüseyn,
Taqəti can aparıb nəğmeyi-Qur`an Hüseyn,
Əcəba olmadı viran hamı dünya bu gecə.

Əlləri üstə alıb Əsğəri biçarə Rübab,
Yandıran sözlərilən aləmi eylərdi kəbab,
Xanə səbrimi ahın ilə dedi etmə xərab,
Nə südüm var nə suyum,neyləyim bu gecə.

Nehzətin lazımı olmuş batasan qanə gərək,
Gedəsən həzrəti-Zəhra yanına qanlı ürək,
Baği-cənnətdə gözləyər yolunu huru mələk,
Sənə xatir bəzənib şaxeyi-tuba bu gecə.

Badə nuşan ələstin ürəyi vəslə əsir,
Dərk edə məhzəri-cananı ürəklər tələsir,
Zeynəbin çarəsin əldən səhərin fikri kəsir,
Yanar odlara düşüb Zeynəbi-Kübra bu gecə.

Kim səhər peykəri üryanə əza saxlayacaq,
Kim o üryan bədəni görcək ürək dağlayacaq,
Qoyun asudə yata, Zeynəb ona ağlayacaq,
Yetəcək başa onun izzəti guya bu gecə.

## ***Aşura gecəsi (nohə)***

Su yox bu gecə bağlanıb əfğanə hərəmlər,
Əllərdə ətəşdən saralıb südəmər Əsğər,
Ətşandı uşaqlar, suzandı dodaqlar.

Əl sinədə qızlar oturub xəmidə nalan,
Ətrafı gəzəllər balalar didəsi giryan,
Səqqaya tutub üz hamı göz yaşlı pərişan,
Yəni dönüb al-qanə hərarətdən o ürəklər,
Ətşandı uşaqlar, suzandı dodaqlar.

Qəlb-hərəmi qan elədi dərdi-Səkinə,
Gülşənləri viran elədi dərdi-Səkinə,
Zəhranı pərişan elədi dərdi-Səkinə,
Əl başda xanım qaçdı bəlalı çölə yeksər,
Ətşandı uşaqlar, suzandı dodaqlar.

Əsğər biləyi əlləri üstündə dolandı,
Tökdü üzünə əşkini alqana boyandı,
Zəhra, gəlinin qönçəsi zülmilə talandı,
Dəst sinəm eylib gül gülzarını pər-pər,
Ətşandı uşaqlar,suzandı dodaqlar.

Zeynəb ürəyin mənzərə qəm dilə gətdi,
Qəmli analar qəlbini durdu ələ gətdi,
Bir ah çəkib ərş üzünə zəlzələ gətdi,
Bu qəmdə gəlib naləvü-əfğanə mələklər,
Ətşandı uşaqlar, suzandı dodaqlar.

## *Kərbəlayə daxil olmaq (nohə)*

Bax bu Neynəva necə basəfadı, Zeynəbim,
Çox bəlası var, adı Kərbəladı, Zeynəbim,

Kə`bədən şərəflidir bu məkani-xoş-nüma,
Zəmzəmi Fəratidir təlli rövzətüs-səfa,
Məskənimdi bu məkan çox deyərdi Müstəfa (s),
Bu çuxur yeri mənə aşinadı, Zeynəbim.

Burda qan olar mənim zülmilə dodaqlarım,
Şümrə dəstgir olar mehriban uşaqlarım,

Qəbrimə ziyarətə hey gələr qonaqlarım,
Gərçi indi zahirən qəmi fəzadı, Zeynəbim.

Bax o xeyməmin yeri bu səfa bu məş`əri,
Bu Mina bu Mərvəsi, bu həmimunun yeri,
Burdan həml edərəm xeyməgahə Əkbəri,
Haqq yolunda Əkbərim çun fədadi, Zeynəbim.

Baxmarıq zaridir şurə zarü-bi səmər,
Burda nəxli din verər şax və bərg və barübər,
Tutiyayi çeşm edər torpağın fereştələr,
Rigi zərdi-torpağı kimyadı, Zeynəbim.

Qanilə bu dəşt qəm sürx bir qəba geyər,
Məhərrəm ola burda kim əyninə qəra geyər,
Burda ali-Müstəfa cameyi əza geyər,
Burda nohə deyənlər biriyadı,Zeynəbim.

Əlli yeddi il gəzib şahrahi eşqidə,
Tapdım öz məzarımı bu nigahi eşqidə,
Mən gərək yatam bacı qətligahi eşqidə,
Mədfəni Hüseyninin gör haradı Zeynəbim.

Bax o nəhrə,görüncə mövc edər bu çöldə ab,
Yeddi gün keçər dönər ab olar bizə sərab,
Oğlu can verər susuz, halına yanar Rübab,
Oddu bu su, mərkəzi-ibtiladı,Zeynəbim.

Baxma nəxli zarə sən olma zaridil qəmin,
Orda düşmənani-həqq eləyir, bacı, kəmin,
Orda qardaşım alar sinə-sinə pərçəmin,
Məşki oxlanar, böyük macəradı,Zeynəbim.

Mən düşəndə torpağa ey insiyəyi- mühən,
Yer edəndə zəlzələ təllidən enəndə sən,
Şümrü sinəmə çıxar qana qərq olanda mən,
Səbri pişə eyləsin, çox becadı, Zeynəbim,

Başım üstünə gələr onda xeyrətün-nisa,
Başını açıb edər ney kimi anam nəva,
Sən dayan vüqar ilə üz verəndə hər bəla,
Bibəla deyil,bura Kərbəladı, Zeynəbim.

Mən gərək təqaiyə lütf edəm bu illətə
Ərz hacət eyləyib babi-rəhm və hacətə
Qoymaram yana onu nari fəqr və həsrətə
Çün bu nökərim mənim biriyadı, Zeynəbim.

## *Aşura gecəsi*

Kərbəlanın bürkü tutub havasın,
Duman alıb nəxillərin arasın,
Yer geyinib təbiətin qarasın,
Axşam olub on gecəlik ay çıxıb,
Uşaqların ürəklərin qəm sıxıb.

Bir tərəfdən qumrilərin nəğməsi,
Bir tərəfdən axar suyun xoş səsi,
Cəzb eləyir mənzərələr hər kəsi,
Göydə çeşmək vurur gözəl ulduzlar,
Su axtarır əziz-girami qızlar.

Xeymələrin işıq vermir məş`əli,
Yerdən göyə bir nur olur müncəli,
Xütbə oxur yerdə delbənd Əli,
Ölməliyəm deyir bari siz gedin,
Qaranlıqda bu ərsəni tərk edin.

Qardaşım,ey gözlərimin ziyası,
De hər kəsin var bu çöldə anası,
Qafilədə gəlib kimin balası,
Məhləkədən canlarını qurtarsın,
Qonaqlıqda ayrı yerə aparsın.

Agah olun bu gün gələn qonaqlar,
Səhər sınar bu səhrada budaqlar,
Əsir olar burda qalan uşaqlar,
Gedin, gedin Allah mənim kəsimdir,
Bir öz başım,bir südəmər bəsimdir.

Gedən gedib qalan tapıb imtiyaz,
Xeymələrdə başlandı razü-niyaz,
Sübhə kimi çoxu qılardı namaz,
Qəm riştəsin çərx dəni toxurdu,
Sübhə kimi Əkbər Qur`an oxurdu.

Hərdəm deyir ay Yəsribin maralı,
Fələk səni məndən salar aralı,
Görsə səhər sənin anan yaralı,
Qəm çölündə qəmdən qəlbi sıxılar,
Oğlum ölsə mənim evim yıxılar.

Hər kim görür xeyməsində RübabıI,
Qəlbində qalmayır bir ləhzə tabı,
Vərəqləyir xeymədə qəm kitabı,
Qan-yaş tökür oğul vay deyə-deyə,
Südəmərin döndəribdir qibləyə,

Belə deyir şərməndəyəm, Əsğərim,
Qalıb bu gün döşlərimdə əllərim,
Yoxdu çarəm axır sirşik tərim,
Südsüz uşaq yatıb məgər dincələr,
Gözəl balam,nəfəsindən od gələr.

Sonbeşiyim, gözəl balam ay balam,
Oldu mənim arzularım zay, balam,
Allah verdi səni mənə pay, balam,
Qəmlər oxu ürəyimə toxunur,
Can verənin gözlərindən oxunur.

Can verirsən ürəyimi dağlaram,
Biləyində əllərini bağlaram,
Susuz bala sənə baxıb ağlaram,
Ümidim gəlmyəir bir şirbə suya,
Üzüm gəlmir gedib deyim əminə.

Göz yaşımı üzarimə ələrəm,
Ürəyimi qəm oxuyla dələrəm,
Qundağını gəh açıb gəh bələrəm,
Gül alnına əcəl təri düzülür,
Gözəl gözün sitarə tək süzülür.

Qoy əminə gedim deyim amandı,
Səbrim evi cəfa ilə talandı,
Əzizimin dil-dodağı da yandı,
Xanım, qəmlər ürəyimdə can verir,
Bir rəhm elə susuz balam can verir.

Ay südəmər əmliyimin əmməsi,
Yandıracaq möhnətim hər bir kəsi,
Çıxmır Əli Əsğərimin də səsi,
Göz axınıb şəqiqələr yatıbdır,
Heç bilmirəm ölübdür ya yatıbdır,

Ləhzə bə-ləhzə çoxalır möhnətim,
Əldən gedir bu gün mənim izzətim,
Ürəkdə var sən bilirsən hacətim,
Gözüm qurban, tökmə belə göz yaşın,
Babül- həvaicdi sənin qardaşın.

Mən bicəhət qəm tozuna batmaram,
Ölsə balam fikrin başdan atmaram,
Sabahkı gün məqsədimə çatmaram,
Dərd çoxalar olmaz vəli dərmanım,
Kərbəlada olmaz mənim qurbanım.

İllət odur bu gecə su gəzərəm,
Su tapılsa hər dərdinə dözərəm,
Səhər olcaq qurbanımı bəzərəm,
Bu xeyməni bəzmi-qəmə döndərəm,
Əsğərimi ox dəminə göndərəm.

## *Vürude- Kərbəla*

Qəm qafiləsi gəldi o gün dəşti-bəlaya, Allah nə gözəl rütbə verib Kərbü-bəlaya.

Zəhra balası Kə`bəni tərk etdi pərişan,
Üz qoydu bu səhraya tərəf gəldi şitaban,
Zəmzəm özü qan ağladı Kə`bə edib əfğan,
Allah evi öz eşq Minasın yola saldı,
Həm Məhşər və həm Sə`y və Səfasın yola saldı.

Tərk elədi mövla hərəmi-əmni-Xudanı,
Çöllərdə dolandırdı Hüseyn Ali-əbanı,
Yollarda nə qədər soruşub Kərbü-bəlanı,
Öz etdiyi peymanına yaxşı əməl etdi,
Gəzdi neçə gün Kə`bəyi-məqsuduna yetdi.

Əmr elədi Əbbasa gedən qafilə dursun,
Həsrətlə çuxur yerdə haman xeyməni qursun,
Nəhr üstə ələmdarı gedib pərçəmi vursun,
Verdi belə dəsturu o gün eşq səfiri,
Can-başla itaət elədi şaha vəziri.

Zəhranın əziz oğlu nəzər hər yana saldı,
Mə`va bu yeri eyləməmiş fikrinə qaldı,
Verdi neçə min dirhəm o maliklərə aldı,
Razı ki, tərəf oldu bu sövdayi-vüsalə,
Katib sənədi yazdı ki, möhr oldu qəbalə.

Zeynəb nigəran halidə qardaşına baxdı,
Bir ah çəkib yandırıb aləmləri yaxdı,
Qəm gərdi qonan surətinə göz yaşı axdı,

Gördü çoxalır burda onun dərdü-məlalı,
Fikr eylədi başdan dağılar cahü-cəlalı.

Ərz eylədi ey şahi-cahan nuri-hidayət,
Qurban sənə yorğun canım ey kani-kəramət,
Yəqin bu yerə çəkdi səni eşqi-şəhadət,
Gülzar edəcəksən bilirəm dəşti-bəlanı,
Tə`rif eləmişdin mənə qəblən bu məkanı.

Fərmayiş edib Zeynəbə salari-şəhidan,
Bu yerdi haman yer, olaram qanıma qəltan,
Əhd eyləmişəm canımı qurban verəm ətşan,
Hətmən o çuxur yerdə qızıl qanə bürünnəm,
Didarıma gəlsin bacı pişvazə sürünnəm.

Səs düşdü o səhrada Hüseyn zadeyi-Zəhra,
Ol dəşti-qəməfzani edib mənzilü-mə`va,
Bir iddə deyərdi nəyə xatir gəlib aya,
Ol şaha qərəz hədyeyi-şayan gətiriblər,
Mərdan qəbilə neçə qurban gətiriblər.

Zəhra balası gördü o qurbanları yandı,
Əl sinədə göz yaşlı del-əfsürdə dayandı,
Mə`nada görüb Əkbəri al-qana boyandı,
Oxlandı Əli Əsğəri meydani-bəlada,
Məhşərdən əlamət görünür xeymə səradə.

Fərmayiş edib şahi-cahan dinə fədayam,
Bey`ət eləməm zalıma, təslimi-qəzayam,
Hər əmri əgər zati-həqqin olsa rizayam,
Ey qoç-quzu qurban gətirənlər eviz abad,
Olsun iki dünya ürəyiz qüssədən azad.

Amma bu yerə mən neçə qurbanilə gəldim,
Əsğər kimi bir qönçeyi-xəndan ilə gəldim,
Yetmiş iki gül sərvü-gülüstan ilə gəldim,
Allah ilə peyman-varım ey əhli-Mədinə,
Əkbər kimi qurban varım ey əhli-Mədinə.

Allah özü Qur`anda deyib nəsrun minəl-lah,
Bu dəşti-qəmə gəlməyimiz sirridi vallah,
Qeyrətli ələmdarimi çox görməsin Allah,
Bu çöldə adamsızlarıma miri-hərəmdi,
Səqqayi- ləb ətşandı dəryayi-kərəmdi.

Aya nə rəvadı ki, məhəbbət gülü solsun,
Zülmilə uzun qolları məndən qələm olsun,
Baş parçalanıb qanı gözəl gözlərə dolsun,
Aya nə rəvadı ki, gəlib ox gözə dəysin,
Qardaşı ölən qardaşının qəddini əysin.

Keçdi neçə gün başa o peymanı çıxıldı,
Qurbanları can verdi susuz qəlbi sıxıldı,
Nəhr üstə yerə qolsuz ələmdarı yıxıldı,
Hicran oxu sür`ətlə gəlib qəlbini dəldi,
Meydana Hüseyn gəldi, İlahi necə gəldi.

Gördü yaralı qardaşını sibti-Peyəmbər,
Bir gül kimi əllərdə olub zülmilə pərpər,
Qardaş dedi dur çıxdı yadımdan qəmi Əkbər,
Bu ayrılığın qəlbimi ox tək dəlir, Əbbas,
Zəhra nənəmin ətri də səndən gəlir,Əbbas.

Ey vaqif olan sirri-əzəl mətləbə qardaş,
Çatdın bu gözəl yerdə gözəl mənsəbə, qardaş,
Dur pərçəmi tapşır qocalan Zeynəbə, qardaş,
Həsrətlə üzə əşkini Zeynəb ələr indi,
Biz getməsək əxyamə Səkinəm gələr indi.

Az qaldı güli başi-məhəbbət sola qardaş,
Göz yolda qalanlar sənə ola qardaş,
Ətşan balalar indi dikib göz yola qardaş,
Dur mənlə gedək xeyməyə, ey şiri-dilavər,
Qardaş sən utanma hələ şayəd ölüb Əsğər.

## *Kəsilə (sinəzən)*

Şahi-din gördü gərək ya başı ətşan kəsilə,
Ya gərək camiədən kəlmeyi-Qur`an kəsilə,
Ya gərək gördü Yəzidə baş əyib bey`ət edə,
Zadeyi-hind verən hökmlərə taət edə,
Ya gərək tiği-şərər-bar çəkib nehzət edə,
Tutdu təsmim öz dininə qurban kəsilə.

Gördü Qur`ana vurur lətmə güruhi-əməvi,
O qədər qalmayır pamal ola şər`i-nəbəvi,
Bir qiyam etdi Hüseyn nəsli-şüca` ələvi,
Ki, gərək zülmü-sitəm etməyə tuğyan, kəsilə.

Dedi baş əymərəm ə`dayə başımdan keçərəm,
İçmərəm su, susuz ölləm, su kimi qan içərəm,
Öz əlimlə balamın qəddinə xələt biçərəm,
Bu Minada gərək Əkbər kimi qurban kəsilə.

Pur Sufyani açıb dinə xəyanət əlini,
Uzadıb pak əlimə sülhü-məvəddət əlini,
Verə heyhat Hüseyn zalıma bey`ət əlini,
Ola gər əllər al-qanlı əlvan, kəsilə.

Əl əgər düz əl ola qiymətə gəlməz elə əl,
Pakdil şəxsə çətindir verə napak ələ əl,
Leyk bir üzri-müvəccəhdi verəm becdələ əl,
Bu günahın əli xoşdur gecə pünhan kəsilə.

Aləmi-zərridən aşiqdi bu sövdayə başım,
Döndərə mətbəxi bir vadiyi sinayə başım,
Nizə başında gedə duri-nəsarayə başım,
Bilələr haqqımı söz qurtula, ünvan kəsilə.

Qoymaram dəysin əcanib əli din pərçəminə,
Din yolunda verərəm Əsğərimi ox dəminə,
Ağlasın xırda uşaqlar gərək Əsğər qəminə,
Gül boğazın biçə xəncər kimi peykan, kəsilə.

Altı aylıq balam axır ox ucundan süd əmər,
Qan içində çabalar, əllərim üstə süd əmər,
Ay batar, ulduz axar, qana batar qursi-qəmər,
Nə olu zahirdə mənə çarəvü imkan kəsilə.

Etməsəm dinimə nüsrət, olur çox nəng mənə,
Yoxdu qorxum tuta dünyanı ədu tək mənə,
Var Əbülfəzl kimi sahibi-örnək mənə,
Qoymaz əldən ələmi ta ələ qoldan kəsilə.

Delxoşam ta yaralı cismimə qan bəstər ola,
Bu muqəddəs başımın balışı xakəstər ola,

Gah yerim nuki cidalar gahi təşti-zər ola,
Həqqim isbat ola, rədd etməyə bürhan kəsilə.

Hər bəla gəlsə güvaradı mənə, yox demərəm,
Azdı hər qədəri yarə dəysə mən çox demərəm,
Ox gəlib qəlbimə sancılsa xoşam, ox demərəm,
Del gərək eşqilə ləbriz ola, nöqsan kəsilə.

Badeyi-kibri Yəzidi eləyib məsti xumar,
Məclisə hazır edib musiqi və şürbü qumar,
Dini baziçə edib əldə o bişərmü-vüqar,
Küfrə tərvic verir rişəyi-iman kəsilə.

Başımı təşnə qəfadan kəsəcəklər bilirəm,
Hamı ağlar mənə mən qəlbidə şadam gülürəm,
Hamı bilsin ki,mən İslam yolunda ölürəm,
Səltənət fikri yoxum,qoy rəhi-böhtan kəsilə.

Zülm bünyanını viran eləməkdir nəzərim,
Zülm oduyla bu məram üstə yanar xeymələrim,
Mən gedən xətt ilə məşyi eyləyəcək şiələrim,
Zalım olmazlar əgər bağları ətşan kəsilə.

Ey Kərimi, sənə tofiq verib rəbbi-cahan,
Lütf edib hüsne rəqəm, tündü-qələm, təb`i-rəvan,
Həsrətim bir budu dünyada verən vəqtə can
Şah gələ yanıva cismindən o dəm can kəsilə.

## *Peyğəmbər vəfatında*

Gəl yanıma cəddin sənə qurban, Hüseynim,
Qur`an oxu ta can verim asan,Hüseynim,
Sənə qurban, Hüseynim!

Gəl qolların sal boynuma, ey mehribanım,
Qoy sinəm üstə başın, ey arami-canım,
Sən ağlasan inciyər mənim ruhi-rəvanım,
Məndən sonra çox eyləmə əfğan, Hüseynim.
Sənə qurban Hüseynim!

Sən qəlbimin aramısan, getmə kənarə,
Əyləş yanımda, munis ol bu biqərarə,
Qoy eyləyim ruxsarına hərdəm nəzarə,
Sənsən yaralı qəlbimə dərman, Hüseynim.
Sənə qurban Hüseynim!

Sən ağlama,ağlar sənə dünya,Hüseynim,
Başın kəsəndə təşnə ləb ə`da, Hüseynim,
Sən ağlasan ağlar anan Zəhra, Hüseynim,
Mən ağlaram ağlar şəhi-mərdan, Hüseynim.
Sənə qurban Hüseynim!

Gəl sal özün bir sinəmə, ey mahi-parə,
Mən də sənin gül-cismini alam kənarə,
Sən can verəndə mən də gəlləm ahü-zarə,
Nə`şin olanda qanına qəltan, Hüseynim.
Sənə qurban Hüseynim!

Məndən sonra ümmət salar başın bəlayə,
Başın vurallar zülmilə nuki-cidayə,
Zeynəb fərağında gələr şurü-nəvarə
Qamçı vurarlar başına hər an, Hüseynim.
Sənə qurban Hüseynim!

Atdan düşəndə torpağa gəlləm harayə,
Zəhra salar gül cisminə zülf ilə sayə,
Zeynəb xeymədə yalvarar əhli-cəfayə,
Leşkər edər əxyamini talan, Hüseynim.
Sənə qurban Hüseynim!

Fəryad o gündən gördülər biçarə Zeynəb,
Şümr ilə məqtəldə gəlib güftarə Zeynəb,
Gah yalvarır Şümrə, gahi əşrarə Zeynəb,
Hər dəm deyir Zeynəb sənə qurban, Hüseynim.
Sənə qurban Hüseynim!

Qardaş bu ləşkər Zeynəbi aldı arayə,
Əldə qara əcz eylirəm əhli-cəfayə,
Ağlar Kərimi ruzi-şəb bu macərayə,
İstər qapından dərdinə dərman,Hüseynim.
Sənə qurban Hüseynim!

## *Şəhidlər ağasının (ə) zəban halı*

Gəl Kərbəla çölündə Minayə, ya Mühəmməd (s)!
Məzlum Hüseynin ağlır səqqayə, ya Mühəmməd (s)!

Gəl başlanıb bu çöldə Əbbasımın əzası,
Ümidimi yıxıblar başında var yarası,
Qardaşım öldü, artdı gəl başımın bəlası,
Doğrandı cismi şan-şan, salimdi gör harası?
Gəlmir ələ edəm həml əxyamə ,ya Mühəmməd
(s)!

Başın açıb bu çöldə gəl gör nə növi Zəhra,
Əkbər qəmin çıxartdı yaddan yaralı səqqa,
Sındı belim düzəlmir, yoxdur belimdə yara,
Az vəqtə Kərbəlada çarəm kəsildi cədda,
Gər ver təsəlli indi Zəhraya, ya Mühəmməd (s)!

Əl tapdılar Hüseynə sərdarımı yıxanda,
Yandı yaralı qəlbim ə`zasına baxanda,
Qardaşımın üzündən öpdüm canı çıxanda,
Əl çaldı əhli-Kufə məqsədinə çatanda,
Qəddi xəmidə baxdım ə`dayə, ya Mühəmməd (s)!

Yalqız qalıb Hüseynin səslər səni haraya,
Qəm oldu çarəm indi tez gəl bu Kərbəlaya,
Sındı belim büküldü bax qaməti rəcaya,
Düşdü gözüm ziyadan gəlləm özüm nəvaya,
Uff olsun indi ciddən dünyaya, ya Mühəmməd
(s)!

## *Ədəbli qardaş*

Amandı aç gözün, oyan, ədəbli qardaş,
Məni yaman günə qoyan ədəbli qardaş,
Gəl ayrı salma məni özündən,
Belim sınıbdı iraq gözündən.

Qərarü-səbrimi qəmin əlimdən aldı,
Şəhid olanda Əkbərim başım ucaldı,
Səsin gələndə xeyməyə Hüseyn qocaldı,
Gedək xiyamə, amandı qardaş,
Pozuldu halım yamandı qardaş.

Dağıtdılar cəlalımı bəlalıyam mən,
Bu çöldə bir solan gülün misalıyam mən,
Mədinə qaldı indi Kərbəlalıyam mən,
Diyari-Şamə gedəndi Zeynəb,
Yezidi rüsvay edəndi Zeynəb.

Cəmali-pak ənvərin qana batıbdı,
Nəvası Əhli-beytimin guya çatıbdı,
Olubdu qolların qələm ələm yatıbdı,
Üzə sirişkin ələr Səkinə,
Bir az yubansaq, gələr Səkinə.

Bu sərvi-qamətə hərəmlərim də qurban,
Peyğəmbərin şəbihi Əkbərim də qurban,
Özüm də, altı aylıq Əsğərim də qurban,
Amandı olma belə mükəddər,
Ölübdü şayəd susuzdan Əsğər.

Gündüzlərin gecə kimi qarası vardı,
Hara gedər qəriblər,harası vardı,
Amandı açma sağ gözün, yarası vardı,
Ümidi-ali-əba Əbulfəzl,
Şəhidi-rahi-Xuda Əbulfəzl.

*******

Ey şəm`i-şəbistani Xuda həzrəti Əbbas,
Canın verən İslamə fəda həzrəti Əbbas,
Ey dərgəhi-kanuni-səxa həzrəti Əbbas,
Sən dərdimizə eylə dəva, həzrəti Əbbas.

## *Əbəlfəzl*

Qalxıb rikabımdan öpüb yalvarsa dərya içmərəm,
Dünya suyundan içməsə övladi-Zəhra içmərəm.

Yol üstə bica durmayın, mən Mürtəza
dilbəndiyəm,
Səf çəkmyəin, yol kəsmyəin, şiri-Xuda
fərzəndiyəm,
Bir iddə ətşan qızlara söz vermişəm,
şərməndəyəm,
Yoxdur sədaqətdə mənim qolumda əmma,
içmərəm.

Eynul-həyata çatmağa məndən pərişandır bu su,
İbrət gözüylə baxsalar qəlbim kimi qandır bu su,

Namərdilər, ox atmayın çox dərdə dərmandır bu su,
Şeş mahə Əsğər içməsə qıllam tamaşa, içmərəm.

Mən hər necə ətşan olam səbri cəmilim var mənim,
Yorğun, susuz qızlar ilə rəncur əlilim var mənim,
Xeymədə əlan bir bölük ətşan dəxilim var mənim,
Babül-həvaic mənsəbim, adımdı səqqa, içmərəmə

Yazdır amannamə çəkəm əl höccət dildaridən,
Mən bu səbəb əl çəkmərəm bu seyyidi-əhraridən,
Qovsa qapısından məni gəlləm yenə divaridən,
Mövladı əmr etsə əgər, cürə su hətta içmərəm.

Tənha Fəratın səmtinə möhr oldu mə`muriyyətim,
Xatir susuzlar xatiri su oldu ə`la niyyətim,
Siz bari namərd olmayın məşgimdədir heysiyyətim,
Xatirlərə mən verməsəm əlan təsəlli, içmərəm.

Sizdə şərafət var əgər əlan verin qövli- şərəf,
Fövrən zirəbəndin açım sinəm sizə olsun hədəf,
Şərti-mürüvvətdən çıxıb ox atmayın məşgə tərəf,
Su axsa gər bu gözlərim həsrətlə baxsa, içmərəm.

Qəlbizdə rəhm açarı yox, ey qövmi-bipərva, sizin,
Pərdə çəkib rüxsarıza sər pəncəyi-dünya sizin,

Bir məşgi mən doldurmuşam nəhro şutu-dərya sizin,
Məndən hərasan olmayın, su mən dəva da içmərəm.

Ey Kufiyan, fikr etmyəin şiri cərahət öldürür,
Cəng etməyə qol bağlıdır, Əbbası qeyrət öldürür,
Siz də məni öldürməsəz, şərmü-xəcalət öldürür,
Cami-şəhadət məstiyəm, şəhdi-müsəffa içmərəm.

Mən xeymələrdən ayrılan saətdə çün ruhi-rəvan,
Birdən qəfadan səslədi öz nökərin şahi-cahan,
Bir məhrəmanə söz dedi Zeynəbdən oldum nagiran,
Aşüftə etdi fikrimi dilbəndi-Zəhra, içmərəm.

Süst eylədi qollarımı öz şahımın bu mətləbi,
Dərs öyrədib Əbbasına manəndi-tifli-məktəbi
Şam əhlini öldürmə çox, yolda döyəllər Zeynəbi,
Əlan giriftar olmuşam,su eylər iza,içmərəm.

## *Vəfalı yaralını (sinəzən)*

Dolanır kənari-Fəratidə, tapa bir yaralı-yaralını,
Görə qardaşın tökə göz yaşın, oyada vəfalı yaralını,

Bacısından istədi mərkəbi, səsini alanda vəzirinin,
Qədəmin rikaba qoyanda şəh, ələmin görərdi əmirinin,

Yıxılıb gedincə ələm yerə, itiribdi rəddini şirinin,
Nə o qanlı pərçəmini görər, nə də məşgi xali
yaralını.

Nə qədər ki, səslir əxa, əxa, eşidə dübarə sədasını,
Kömək istir aləmi-qeybidən, çağırır haraya
anasını,
Anacan Hüseyninə əl yetir, gülünün pozublar
səfasını,
Əyilib belim baxıram yerə, tapam ol vəfalı
yaralını.

Kömək etdi Fatimə nagəhan, tapıb inkisarilə
qardaşın,
İki qol yol üstə görüb əvvəl, ələyib üzarına göz
yaşən,
Dalısıyca hey dolanıb tapa, kəsik əllərin yaralı
başın,
Nə görüb o qollarillən bir az , yıxılıb aralı
yaralını.

Götürübdü başdan əmmaməsin, dedi ey haman
şərəf danış,
Görürəm biaz rəməqin qalır, eyləmə bu vəqti
tələf, danış,
Bilirəm dalınca anam gəlib, aparır behiştə tərəf,
danış,
Çağırar cinanə cihadidən, bəli zülcəlalı yaralını.

Bu da fəzl həqdi ki, istədi, çıxa yaddan
Əkbərimin qəmi,

Eylə yanmadım qəmi-Əkbərə, bu qəmilə dağladı sinəmi,
Dur ayağa xeyməyə bir gedək, gözü yolda qoyma Səkinəmi,
Görə bəlkə gözləməyə qızım, daxi mahi sali yaralını.

Xətərati-cəng budur ki, ox dəyə bəndi-qəlbə, qılın başa,
Yara Əkbərinkidi bir qılın, başına dəyib oturub qaşa,
Başına sənin baxan az qalır deyə şüşədir toxunub daşa,
Belə hala kim salıb ey Xuda, bu başı bəlalı yaralını.

Dönə daşa toxme-vəfa əgər, hər ürəkdə hasilə gəlməsə,
Qızılın əyarını kim bilər, məhəki müqabilə gəlməsə,
Qəmü-qüssə bülbülü lal edər, gül əgər gülüb dilə gəlməsə,
Eylə zövqilə gətirib dilə, o şəhin vüsalı yaralını.

Dedi ey muradi-qəm, nəfəsi müqəddəsi kimiya,
Neçə ildi təşnə müridim, belə xalisanə və biriya,
Əlini çək indi bu gözlərə, sən ey aləmin gözünə ziya,
Səni yoxsa görməsə öldürər, bu əsfəli hali yaralını.

Niyə indi səndən ürək sözün eyləyim nihan,gedirəm, Hüseyn,
Məni öz xəcalətim öldürür, ürəyimdə qan gedirəm, Hüseyn,
Ölürəm, vəfalı Səkinədən eylə nagiran gedirəm,Hüseyn,
Su deyəndə hərdəm utandırır hərəmin maralı yaralını.

Eylə yaxşı xidmət edib sənə, qəm odunda yanmadı qardaşın,
Özü səslədi gələsən vəli, ayağa duranmadı qardaşın,
Xəcil oldu axır ömrüdə, başına dolanmadı qardaşın,
Odu inzicarilə öldürür, bu qəmi məlalı yaralını.

Bu məsəldi Şimri sitəmgərin işi məhşərin günü səhlidi,
Belə hiss olur ki, o zalımın qəmi yoxdu düşmən əhlidi,
Vay o şəxsə Münzəvi, düşməni gözü bağlı, aləti cəhlidi,
Verə Şam Zeynəbin adına, qoya dəstxali yaralını.

## *Əbbasın kömək istəməsi*

Yatdı ələmim ey şəhi-sahib kərəmim gəl,
Başımda olan sayəni kəsdi ələmim gəl.

Qurban olum ol ərşə çatan payüvə qardaş,
Rəhm et əli boş nökəri bimarüvə qardaş,
Sal sayeyi rəhmət sıxılım sayəninə qardaş,
Qoy neçə dəqiqə yaralı sayədə qalsın,
Axır yaralı başımın əhdi yerin alsın.

Düşmən əlinə düşdü qələm bu qələm əldən,
Əmma kəsilən əldi kəsilməz kərəm əldən,
Gər layiq ələmdar ola verməz ələm əldən,
Məndən nigaran olma sən ey şahi-xocəstə,
Düşdü əlim amma ələmin sinəmin üstə.

Meydana yıxıldı yenə məstanələrindən,
Gəl yandı kül oldu biri pərvanələrindən,
Kim qaldı pərəstar ola dürdanələrindən,
Kəşti ümidim sındı sahilə düşdü,
Səqqa xəcil oldu sözü dildən dilə düşdü.

Qanə qarışıb gözdən axan yaş, suya xatir,
Gəl görüncə düşdüm oda qardaş, suya xatir,
Qol getdi girov möhlət alıb baş suya xatir,
Baş da tələsir zibh oluna şah qabağında,
Ruhum quşu şahın vura cəh-cəh qabağında.

Ey kaş bir az məşgidə sovqatım olaydı,
Səqqalığıma mədrəki isbatım olaydı,
Bir yerdə Səkinəylə mülaqatım olaydı,
Solmuş gülə bari öz əlimlən su səpəydim,
Su camı öpən ləbləri bir də mən öpyədim.

Gördün iki əngüştlə əhrimən əlindən,
Aldım necə öz nizəsini düşmən əlindən,
Qardaşım Həsən mərkəbin aldım mən əlindən,
Öldürmə dedi əfv elə bu süflə məramı,
Nizə yerinə boynuma vur möhri qulamı.

Gör indi necə acizəm əldən məni nalan,
Hər aciz atır nizə edir qəlbimi şan-şan,
Qadir deyiləm heç gələni qaytaram əlan,
Bak eyləmərəm yüz belə bidadgər olsa,
Əlbəttə gözüm görsə əlimdə sipər olsa.

Meydana gələn vəqtdə mən, ey şahi-mükərrəm,
Etmişdi Rübabın halı əhvalımı dərhəm,
Hər qiymətə olsa dedim əlan su gətirrəm,
Əfsus suyun qiyəməti bəllənmədi qardaş,
Bir söz dedi düşmən aşağı enmədi, qardaş.

Getdim nəzərə Əsğəri zehnimdə mükərrər,
Gördüm ağarıb rəngi, süzür hey qara gözlər,
Əz bəski, əmib ləblər olub qonçeyi-əhmər,
Ənzarə çıxa göz dəyəcək gözlərə gördüm,
Bu sağ gözümü Əsğərə göz muncuğu verdim.

## *Hüseyni ziyarət edən, Allahı ziyarət edər ərşidə*

Pərvaz edir ürəklər - gülzari-Kərbəlayə,
Əhsən deyir mələklər - zəvvari Kərbəlayə.

Hər kəs edə ziyarət  sultani-Kərbəlanı,
Guya edib ziyarət ərşində kibriyanı,
Sə`y elə vermə əldən - bu feyzi-cavidanı,
Tez gəl amandı, tez gəl  didari-Kərbəlayə.

Hər feyzidən müqəddəm,  hər fərzidən fərizə,
Yaz altıguşə qəbrə  əşgilə ver ərizə,
Xaki-şəfanı İslam  əşkinlə ver mərizə,
İxlasilə dəxil ol dərbari-Kərbəlayə.

Bu rahi-Kərbəladı,  rəncü-bəlasız olmaz,
Eşqin yolu çətindi,  qəmsiz nəvasız olmaz,
Tök göz yaşın camalə  qədrü-bəhasız olmaz,
Göndər bu dürrü-əşki  bazari-Kərbəlayə

Bir səs gəlir rəvaqdan vay oxlanan balam vay,
Dərya yanında ətşan gül tək solan balam vay,
Pərvanə tək əşrari  şə`mə yanan balam vay,
Seyd oldun ey qəzalım əşrari-Kərbəlayə.

Tufandı Neynəvada,cəm əyləşib cəm üstə,
Matəmdi mətəm üstə,hey qəm gəlir qəm üstə,
Səqqayi-Kərbəlanı tap nəhri-Əlqəm üstə,
Hər dərdin olsa söylə sərdari-Kərbəlayə.

Çıx təlli Zeynəb üstə bax qəmli xeyməgaha,
Zeynəb o təllin üstə çox qaçdı qətligaha,
Əl xəncərə atanda tə`sir edib sipaha,
Ağlaşdı qovmi-kafir qəmxari-Kərbəlayə.

Bilməm nə məhşər oldu əl xəncərə atanda,
Əllər yaralananda, mə`cər qana batanda,
Gün batdı Şümri-zalım amalına çatanda,
Ləşkər xəbər apardı bimari-Kərbəlayə.

Bir ömür səslənibsən ya Kərbəla, Kərimi,
Bu Kərbəla, bu sənsən, eylə nəva, Kərimi,
Əqvam və aşnayə eylə dua, Kərimi,
Birdə çətin düşər yol bazari-Kərbəlayə.

## *Əbulfəzlil Əbbas (ə) şəhadəti*

Hardasan arxam elim, sındı belim, yatdı ələm, qardaş,
Məşkimi oxladılar hər iki qol oldu qələm, qardaş,
Gəl ölürəm qardaş,can verirəm qardaş.

İftixar eylərəm öz eylədiyim əhdə vəfadarəm,
Leşkər mərifət eşqə ələmdarəm və sərdarəm,
Hamiyəm dinimə, Qur`animə İslamə fədakarəm,
Kasə ləysə və xədəm cürmü-cinayət deyiləm, qardaş,
Gəl ölürəm qardaş, can verirəm qardaş.

Demirəm getdim özüm,əlləri qoynunda anam qaldı,
Demirəm gözləri yollarda şirin dilli balam qaldı,
Deyirəm düşmən içində yaralı yalqız ağam qaldı,
Verəcək üz sənə mənsiz qəmü-ənduh və ələm,qardaş,
Gəl ölürəm qardaş  can verirəm qardaş.

Dağıdıb murü-mələx tək qoşunu, at döşünə saldım,
Su yolun açdı cəmaət üzümə Əlqəməni aldım,
Başımın sahibi gəl başıma baş çək, baş açıq qaldım,
Heyf ola çarə yolun kəsdi mənə qovmi-zuləm, qardaş,
Gəl ölürəm qardaş, can verirəm qardaş.

Gərçi su və`dəsi vermişdim özüm itrəti-ətharə,
Nə qədər su var idi təng elədim ərsəni küffarə,
Məşkim oxlandı, mənə zülmilə bağlandı rəhi-çarə,
Ver xəbər gözləməsin su yolunu əhli-hərəm,
Gəl ölürəm qardaş  can verirəm qardaş

Nə şikayət edərəm gözdə olan tiri-şəqavətdən,
Nə gilayəm var,əxa, Nöfəl edən zülmü-cəsarətdən,
Ürəyim yandı sinəm təngə gəlib tə`nü-şəmatətdən,
İntizaram gələsən ta sənə qurban kəsilim, qardaş,
Gəl ölürəm  qardaş, can verirəm qardaş.

Elə şad oldum əzəl qoydu əcəl, nəhrə yola düşdü,
O qədər çəkmədi bir kani xəta vurdu qolum
düşdü,
Sağa döndüm yaralandım, sola döndükcə solum
düşdü,
Məşkdən su tökülənde ürəyim etdi vərəm,
qardaş,
Gəl ölürəm qardaş,can verirəm qardaş.

Tiri baran elədi əhli-cəfa, balü-pərim sındı
Dəydi bir zərbəti səngin başıma camisərim sındı,
Mərkəb üstdən üzüm üstə yerə gəldim kəmərim
sındı,
Dörd tərəfdən ələnir peykərimə tiri-sitəm,
qardaş,
Gəl ölürəm qardaş, can verirəm qardaş.

Can çıxınca su verəm, səhm aparam feyzi-
hüzurundan,
Ruhumu şad eləyim qəbrə kimi lüm`əyi-
nurundan,
Teşnəyəm, gəl məni sirab elə öz abi-təhurundan,
Gəl qolun boynuma sal, nökərinəm, elə kərəm,
qardaş,
Gəl ölürəm qardaş, can verirəm qardaş

Gəl hüzurunda əxa, bəzl eləyim canımı canana,
Qatilim indi qoyar xəncəri bu həncəri-ətşanə,
Yazacaq nöhə Kərimi, gələcək rüzi-şəb əfğanə,
Məndə can üstə salıb yada, ona baş çəkərəm,
qardaş,

Gəl ölürəm qardaş, can verirəm qardaş.

Demirəm layiqəm Əbəlfəzlə,
Nökəri-sadiqəm Əbəlfəzlə,
Hər kim irad edir mənə etsin,
Qəlbidən aşiqəm Əbəlfəzlə.

Qəlbim qəm ilə dolsa, Əbəlfəzlə ağlaram,
Güllər çəməndə solsa,Əbəlfəzlə ağlaram,
Yad eylərəm o saətini düşdü qolları,
Ömrüm min ildə olsa, Əbəlfəzlə ağlaram.

## *Qardaşına (nohə)*

Gəl, Hüseyn, əl tapıb əşrari-zaman qardaşına,
Təng olub zülmilə vüsətli cahan qardaşına.

Şiri-mərdan, sala leşkər tələsir bəndə məni,
Dişdə şəmşir edirəm düşmənilə cəng ələni,
Əlsizəm, toprağa amma yıxıram hər gələni,
Gərçe yox barişi peykandan aman qardaşına.

Hər kimin pəncəmə keçsəydi cədəldə kəməri,
Pərt edərdim yerə qalmazdı nəfəsdə əsəri,
İş dönüb Kufənin acizləri ifritləri,
Dörd tərəfdən əl açıb indi haman qardaşına.

Çün şəqaiq boyanıb qırmızı qana kəfənim,
Deli tufanda sınan kəştiyə bənzər bədənim,
Zirehim parələnib, oxlar olub pirəhənim,
Qalmayıb cismimdə salim şiriyan qardaşına.

Qəlbidən rişteyi-hicranına lazımdı kəsəm,
Yer var aşiqinəm vəslinə xatir tələsəm,
Əkbərin canına verəm səni ey şahi,qəsəm,
Can verən ləhzələrimdə demə can qardaşına.

Ətrini alsam əgər ey şəhi-fərxəndə xisal,
Para şəhpərlərimlə yenə vuram pərü-bal,
Sən gələn vəqtdə sürünnəm edərəm istiqbal,
Öpərəm məqdəmini qalsa təvan qardaşına.

Salıb əşrari-dəni torpağa bir-bir qolumu,
Qan dolub gözlərimə görməyirəm sağ-solumu,
Bir şəqi ahəni əmud əldə kəsibdir yolumu,
Əlsizəm əl yetir əllərdə qalan qardaşına.

Neyləyər fikr eylə çəkiş toxuna daş-qaşıla,
Nə hala ayna düşər gər hədəf olsa daşıla,
Neyləyər ahəni-əmud incə sipərsiz başıyla,
Üz verib gör necə böhrani-zaman qardaşına.

Doğranıb peykərimin ərseyi-dəvadə çoxu,
Arifanə sözümü qardaş özün sözdən oxu,
Əllərim yoxdu necə xaric edim gözdən oxu,
Baş yetir xeymələrindən nigaran qardaşına.

Dolu tək daşdı yağır oxdu kəsilmir arası,
Əzilib başım əmudilə olub ay parası,
Yıxa bilməz məni ox, yıxsa yıxar dil yarası,
Toxunur tiri kimin zəxmi-zəban qardaşına.

## *Əbbasın (ə) anası Ümmül-bəninin zəban halı*

Çox ağladım ahü-zardan yoruldum,
Bu həyati təlx bardan yoruldum,
Hamı gəldi mənim balam gəlmədi,
Bu qapıda intizardan yoruldum.

Ürəyimin gedən dayağı, ey vay,
Dama düşən şikar sayağı, ey vay,
At üstündən yerə qolsuz düşəndə,
Üzəngidə qalan ayağı, ey vay.

## *Ümmül-bənin diliycə (nöhə)*

İftixari-ali-Haşim sahib ələm, balam vay,
Nəxli-zaridə su üstə qolları qələm balam vay,

Kərbəla çölündə gördü bağlanıb Hüseyn qiyamı,
Sadiqanə xidmətinə razı eyliyib imamı,
Qətlgahda can verəndə göndərib mənə pəyamı,
Göz yaşı olan mərkəb, kipriyi qələm balam vay.

Çox dedi mənə xanımlar bu həyatda, bəxtəvərsən,
Fatimə gəzən otaqda iftixarilə gəzirsən,
Heç biri deməzdi bir gün qara pirəhən geyərsən,
Qoymadı zəmanə axır məndə dincələm, balam vay,

Şəhri-Yəsribə pərişan qəmli karivan qayıtdı,
İtrəti-rəsuli-xatəm oldu bağrıqan qayıtdı,

Öldü Zeynəbin Hüseyni qaməti kaman qayıtdı,
Səslədim qəriqi bəhr, mühnəti-ələm, balam vay.

Qarəsin başından açmaz qəlbi dağdar olanlar,
Mən kimi ölüncə ağlar piri-ruzgar olanlar,
Məclis əzanı xoşlar daim əşkbar olanlar,
Var yeri belə ölüncə naləyə gələm balam vay.

Zeynəbim deyir şərari-itilada yandı qolsuz,
Rubəru ədulərilə qərdaşım dayandı qolsuz,
Sinəsində qanlı pərçəm məqtəli dolandı qolsuz,
Torprağa necə düşübdü mən mə`tələm balam vay.

Axşam olcağın yətimi göz yaşın üzarə bağlar,
Gün batanda ahı artar, qəlbi-əqrəbanı dağlar,
Verəm hər qədər təsəlli vaysınar, ürəkdən ağlar,
Bağlanar gecə dübarə səxt mərhələm, balam vay.

## *Ətşan səqqayəm*

Atdan yıxıldım torpağa gəl Hüseynim gəl,2
Torpağa üz qoydum əxa, gəl Hüseynim gəl,2
Səqqayi-ətşanam - qanıma qəltanam.

Qaldı susuzlar teşnələb xeymədə,qardaş, [2]
Cam əldə qızlar teşnələb xeymədə,qardaş,2
Əsğər çalıxlar teşnələb xeymədə, qardaş, [2]
Qəmxanə oldu Neynəva gəl Hüseynim gəl.[2]
Səqqayi-ətşanəm - qanimə qəltanam.

Müşkün düşübdü bir yana nəhr Əlqəmədə,[2]
Pərçəm batıbdı al qana nəhr Əlqəmədə,[2]
Qollar düşübdü torpağa nəhr Əlqəmədə,[2]
Can eylərəm dinə fəda, gəl Hüseynim, gəl,[2]
Səqqayi-ətşanam - qanıma qəltanam.

Rütbeyi-vala verib Əbbas, həqq yekta sənə,
Bəsdi bu şə`nidə oğlum səsləyib Zəhra sənə,
Ənbiya həsrət çəkibdir bir Hüseyn tək qardaşa,
Verməyib heç bir kəsə Allah verib tənha sənə,
Səqqayi-ətşanam - qanıma qəltanam.

Əzizi-Fatiməyə sahibi-ləvasan, Əbəlfəzl,
Əbul-əimmə kimi məzhəri vəfasan, Əbəlfəzl,
Üzün qoyan qapına mətləbin alar səndən,
Deyər məqamına qurban düyün güşasən
Əbəlfəzl,
Səqqayi-ətşanam - qanıma qəltanam.

Bağban ölsə gül dərəndə kim ağlar,
Bülbül getsə bu çəməndə kim ağlar,
Sən öləndə mən ağladım, Əbəlfəzl,
Başım üstə mən öləndə kim ağlar?
Səqqayi-ətşanam - qanıma qəltanam.

## *Heydər oğlu*

Ey Kufiyan siz çıxmayın sözümdən,
Su olmasa mə`yusəm öz-özümdən,
İnsaf edin məşkimə ox vurmayın,
ləşkər, vurun bu oxları gözümdən.

Ləşkər, mənəm saqiyi-kövsər oğlu,
Dava günündə şiri-davər oğlu,
Susuzlara müjdə verir Səkinə,
Nəhri alıb bu gündə Heydər oğlu,

Oxlar gələndə at belində yatdım,
Düşmənlərin dərdü-qəmin çoxaltdım,
Qanla liva sağü-sola axanda,
Din pərçəmi xəm oldu, mən ucaltdım.

Qan-qan deyən oxlar gəzir havada,
Məşk axtarır səhrayi Kərbəlada,
Agah olun su məşkimi oxlasaz,
Tufan qopar bu vadiyi-bəlada.

Mən və`də vermişəm ay-ulduzlara,
Təşnə qalan xeymədəki qızlara,
Su məşkim oxlansa yerə su axar,
Var nə cavabım o oğulsuzlara.

Getsə su məşkim xeyməyə salama,t
Qopmaz bu çöldə şürüş-qiyamət,
Üç gün olur Əsğər yanır susuzdan,

Peyğəmbər ilə etməyin ədavət.

## *Həzrət Əbulfəzl (ə) (Cuş)*

Əbəlfəzləm, vəfa dəryasıyam mən,
Bu çöldə təşnələr səqqasıyam mən.

Əgər sağ qol düşübdür peykərimdən,
İtaət eylərəm öz rəhbərimdən,
Ciyər qanı tökülsə gözlərimdən,
Kənara çıxmaram bu səngərimdən,
Qitalın şir bi pərvasıyam mən.

Bu tezliklə yıxılmaz Heydər oğlu,
Təlaş eylər ölüncə səfdər oğlu,
Məhi salaridir Peyğəmbər oğlu,
Olubdur qət`ə-qət`ə Əkbər oğlu,
Oğulsuz sərvərin arxasıyam mən.

Bu qədər vurmayın tirü-xədəngi,
Həras etməz ölümdən mərdi-cəngi,
Mənəm lərzan edən bu tip vəhəngi,
Əgərçe şəhdimə qatdız şərəngi,
Hüseynin xəncər almasıyam mən.

Əgərçe qollarım düşdü bədəndən,
Əgərçe qəlbim odlandı mühəndən,
Əgərçe kam alırsız indi məndən,
Bilin qorxmaz hüma zağü-vəzəqdən,
Şücaət qafın ənğasıyam mən.

Hüseynin bargahında vəzirəm,
Bəni-haşim ara mahi-münirəm,
Fədakaram, vəfadaram, şəhirəm,
Babam Heydər kimi şiri-dəlirəm.

Məni oxlar salanmazdı dözümdən,
Desəm aləm yanar odlu sözümdən,
Gəlib üç şöbə ox dəydi gözümdən,
Süzür mərcan kimi qanyaş üzümdən,
Bu kənizin göhər həmsərasıyam mən.

Yolumdan rədd olun, ey qövmi-süfyan,
Edirsiz sağü-solda belə tüğyan,
Əlim yoxdur nədən olduz hərasan,
Gözüm təsvir edənmir çun tutub qan,
Bu meydanın yel həycasıyam mən.

## *Bayrağa müraciəti*

Qal sinəm üstə pərçəm, miri hüda gəlincə,
Biganə yerdə düşmə ta aşina gəlincə.

Ətrafdan baxırlar qövmi fitən yıxılma,
Qoy gözləyək gəlincə şahi-zəmin, yıxılma,
Düşmən şəmatət eylər, səbr eylə,sən yıxılma,
Gözlə o xeymələrdən birdən səda gəlincə.

Yoxdur bədəndə qollar bir belələngər etmə
Sağü-sola əyilmə, torpağlar üstə getmə,
Qal sinəm üstə bari, çox meyl edib qayıtma,
Gəl gözləyək Hüseyni ol bavəfa gəlincə.

Ox vurdular başımdan, qanım axıb üzarə,
Düşdü bədən qüvvədən, məşgim olubdu parə,
Sən yatma bircə rəhm et, bu zarü-del fekarə,
Sən pərəçəmi-Hüseynsən, yatma liva gəlincə.

Rəhm etmədi cəmaət, ox vurdular Hüseynə,
Çəkdim oxu dizimlə qan axdı hər qaşımdan,
Etmə məni xəcalət istəkli qardaşımdan,
Əl qanlı sinəm üstə hər macəra gəlincə.

Su vədə vermişdim mən Əsğərə, bilirsən,
Üç gündü dəyməyib su çox ləblərə bilirsən,
Sədmə yetib bu çöldə bu əllərə, bilirsən,
Et təkyə qanlı başa dərdə dəva gəlincə.

Oxlar dəyəndə qan-qan fövrən qabaqladım mən,
Məşgi basıb qucağa hər növi saxladım mən,
Qət olmuş əllərii sən də daraqladım mən,
Sə`y eylədim yıxılma, müşkül güşa gəlincə.

Ey adı Əbdi saleh ey mənbəi-kəramət,
Bu dərdməndə sən də eylə özün inayət,
Şairlər içrə məndə yox eylə bir ləyaqət,
Adın qalar dilimdə can ağzıma gəlincə.

## *İmam Hüseynin dililə*

Əbbasımı düşmən yıxıb meydana,Zeynəb,
Məşk oxlanıb pərçəm batıb əmana,Zeynəb.

Qardaşımı yıxdı yerə qövmi-şəqavət,
Day əl açarlar sizlərə əhli-ədavət,
Amadə ol, oldu sənə axır-qiyamət,
Ey qəm çəkən, səbr et, gələn hicranə Zeynəb.

Aləm yanar Əbbasımın hər bir qəmindən,
Əhli-hərəm ağlar, yanar bu matəmindən,
Çox-çox hifazət eylədi öz pərçəmindən,
Axırda təslim olmadı üdvanə, Zeynəb.

Dərk eləyən vaxt səsin səbrim azaldı,
Qəlbim alovlandı mənim rəngim saraldı,
Qardaşımın gül peykəri sinəmdə qaldı,
Qurban olum mən eylə bir qurbanə, Zeynəb.

Və`də verən axır gedər çun və`də gahə,
Qandan yetibdi münxəsif rövşənli mahə,
Şam əhli əsla baxmadı bu suzi-ahə,
Döndü gözüm yaşı mənim ümmalinə, Zeynəb.

Ox vurdular məşgə, axıb yerdə əmanət,
Əbbasıma ol halidə oldu qiyamət,
Teşnə qalan ətfalidən çəkdi xəcalət,
Yandı uşaqlar atəşi suzanə, Zeynəb.

Atdan düşəndə qardaşım qəlbim sıxıldı,
Birdən dedim ey vay, evim Allah, yıxıldı,
Qan gəldi başdan gül üzə neylim yıxıldı,
Haqq müştəridir vaqiən ol qanə, Zeynəb.

Məqtəldə aldım nə`şini cəllad əlindən,
Ahunu qurtardım bu gün səyyad əlindən,
Ey-vay Nöfəl xanəsi bərbad əlindən,
Yarə vurubdur bu del şanə-şanə, Zeynəb.

## *Əmannamə həzrət Əbulfəzl (ə)*

Gecə-gündüz əhli-beytin səri-pasibanı qardaş!
Sənə Şümr namə gətdi,atamın nişanı qardaş!

Bu bəlalı çöldə söz yox olasan sipaha sərhəng,
Sən olan məkanda vurmaz başıma bu kufiyan
səng,
Mənəm üstə olma, qardaş dəri bargahda deltəng,
Bu Hüseyn Xudaya versin gərək imtahanı,
qardaş!

Vuracaq sinan zalım başıma əxa sinanə,
Edəcək o Kufə əhli başımı daşa nişanə,
Bu kəsik başım bəradər, batacaq dübarə qanə,
Olacaq o nizə başı başımın məkanı, qarda!

Olasan bu kufiyana atam oğlu, sən də sərdar,
Nə yanar xiyamə diba,nə çölə qaçar bu qızlar,
Nə minər sınıq kəcavə, nə bacıların qan ağlar,

Nə gedər Dəmeşqə Zeynəb, nə yanar zəbanı,
qardaş!

Nə cənazəmi kəfənsiz qoyasan qala, bəradər,
Nə xiyamdan hərəmlər gələ qətligaha yeksər,
Gedəcək başım cüdada, qalacaq bürəhnə peykər,
Bu Hüseyn vətən edibdir belə qəm fəzanı, qardaş!

Nə Səkinə at döşündə dolanar bəla çölündə,
Tapacaq bü rəhnə nə`şi əxa, Kərbəla çölündə,
Əli Əkbərimdi qurbani-həqqə bu Mina çölündə,
Cəm eylə məgər sözüm var bağa şamiyanı,
qardaş!

Məni qovma sən qapından, şahi-Kərbəla,
amandır,
Əli Əsğərin başına məni xeymədə dolandır,
Əli Əkbərə qulamam, bu qapında daldalandır,
Eylərəm təsəddüq Əkbər başına bu canı, qardaş!

Əzəl al bu tiği məndən, yola sal məni şahənşah
Gedərəm Nəcəf çölündə edərəm babamı agah,
Deyərəm Hüseyn qovubdur qapıdan məni çəkim
ah,
Ucalar dəri-Əlidən dilimin fəğanı, qardaş!

Ver icazə qana ol boyanım bu Kərbəlada,
Səri pa kuyi Hüseynim görə bilmərəm cidadə,
Kəsilər uzun bu qollar qala peykərim arada
Tökərlər Fəratın üstə yerə ləxtə qanı, qardaş!

Sən həzrət Əbulfəzl edərəm bu dərdi izhar,
Neçə ildi mən dəxiləm sənə,et nəzər, ələmdar,
Yatışıbdı damənindən gözü yaşlı xırda qızlar,
Eylədim bu eşqi sabit sənə bir də anı, qardaş!

## *Əbəlfəzlin dililə*

Məşgim olub gözüm kimi tiri-qəmə nişan,
Hüseyn!
Saldı məni üqabidən torpağa Kufiyan, Hüseyn!

Əynimə geymişəm əxa, qırmızı güllü camə mən,
Sə`y elədim su məşgimi ta yetirəm xiyamə mən,
Heyf ola xali oldu məşk, yetmədim indi kamə
mən,
Gəl bu fədayi-eşqini etgilən kamiran,Hüseyn!

Yarələrin əziyyəti olsa da gəlmərəm dilə,
Qanilə-gözlərim dolub, yanam əxa, bu nisgilə,
Yoxdu bu çöldə bir nəfər gözlərimin qanın silə,
Başımın üstə əzm elə halım olar əyan, Hüseyn!

Gözlərimi tutubdu qan, xeymədə çox yubanma
gəl,
Başda əmud yarəsi, qalmadı peykərimdə əl,
Gözlərimi nişan edən əllər ola həmişə şil,
Qollarım qayimin məni eylədi natəvan, Hüseyn!

Peykərimin qanı axır yoxdu qiyama taqətim,
Ğütəvər olmuşam qəmə, vardı ürəkdə hacətim,

Nail elə məramıma şəmi-şəb səadətim,
Şirüvi damə saldılar ləşkəri Kufiyan, Hüseyn!

Ey atamın nişanəsi, pərçəmin oldu sərnigun,
Düşmənim həddən keçib, cismim olubdu qərqi-xun,
Başımı istəyir kəsə ləşkər pəstü-rəzilü-dun,
Gəl kəsə başımı ədu məqdəminə inan, Hüseyn!

Qan düzülüb dodağıma ey gözümün ziyası, gəl,
Başımın hər qədər ola xoşdu bu ibtilası gəl,
Qardaşının bu vəqtidə ərşə yetir nəvası gəl,
Qoyma qəmində qızları eyləllər fəğan, Hüseyn!

Düşcək üqabidən yerə dövrəmi aldı Kufiyan,
Aldı araya nə`şimi bir neçə din evin yıxan,
Şiri-Xida nişanə səni oxlara olmuşam nişan,
Sındı əmudilə başım cari olubdu qan, Hüseyn!

Qızları qoyma xeymədə çox gələ ahü-şivənə,
Başın üstə çox gülür, düşmənim əl çalır mənə,
Başımın üstə tez yetiş, çoxdu sözüm deyim sənə,
Şahidim olar qollarım, vermişəm imtahan,
Hüseyn!

## *Əbbasın oğlu Əbdullahın zəban halı (sinəzən)*

Ana məgər nə istədim, babam utandı gəlmədi,
Nədən yubandı bu gecə, çırağ da yandı gəlmədi.

Əgər uzaq gedirdi bəs nədəndi könlüm almadı,
Nəvaziş ilə boynuma uzun qolunu salmadı,
Məgər xarab olub bu ev ki, sərpərəsti qalmadı,
Xəbər varındı qıl bəyan mənə nihandı gəlmədi.

Səhər gedən gərəkdi gün qürub edən zaman gələ,
Namaza şirkət eyliyən eşitcəyin azan gələ,
Görüşmədim soruşmadım haçan gedir, haçan
gələ,
Odur dalıyca göz yaşım belə rəvandı,gəlmədi.

Məni ayırma bu gecə yanında saxla, qorxuram,
Çırağı xamuş eyləmə, qapını bağla, qorxuram
Yerimi öz yanında sal, məni qucaqla, qorxuram,
Gözündən atma bari sən babam yubandı
gəlmədi.

Bu söhbətimdən olmaya gərək şikəstə xatirin,
Ki, oxşamır qəm əhlinə mənim yanımda zahirin,
Hara gedib ki, axşama qayıtmayıb müsafirin,
Ürək sıxıldı səbrimin evi talandı gəlmədi.

Nə qədri yatdı diksinib durub qiyamət eylədi,
Qəziyyəni balasına ana hekayət eylədi,

Yavaş-yavaş o nazənin fəraqa adət eylədi,
Yetişdi günlər aylara ilə dolandı gəlmədi.

Qərəz fəraqə xu tapıb ikisi bahəm ağladı,
Müqəyyəd oldu tay tuşun görəndə kəm kəm ağladı,
Gələndə şəhri-Yəsribə o qanlı pərçəm ağladı,
Hezar heyf ki, sahibi qana boyandı gəlmədi.

Yetişdi rüşdə bir qədər elə ki bildi mətləbi,
İmami-Zeynül-abidin verərdi dərsi-məktəbi,
Cavanlar ilə küçədə edərdi bəhsi məzhəbi,
Məqami elm və fəzilətin görən dayandı, gəlmədi.

Deyərdi Fatimə anam opən gəlin gülabiyəm,
Nejadi-Haşimidənəm, təbari bu turabiyəm,
Mən inqilabi oğluyam, özüm də inqilabiyəm,
Şəhadət arzusunda varam haçandı, gəlmədi.

Həmişə arzudayam imam fürsət eyləyə,
Mədinə əhli sidq ilə o şaha beyət eyləyə,
Əleyhi küfrü-zülmə ta qiyamü-nehzət eyləyə,
Əyan ola cahanda kim bu haqqı dandı, gəlmədi.

Gərək Bəni-Üməyyəyə bu ruzigarı təng edə,
Tamami səngdillərin nişanəyi-xədəng edə,
O qanlı pərçəmi verə məni vəziri cəng edə,
Bu arzuda qəlbimin tənuri yandı, gəlmədi.

## *Əli-Əkbərin bacısının zəban halı (Sinəzən)*

Qoy edim nəzər doyunca belə məh camala, qardaş,
Oxuyum və in yəkadu sora get cidalə, qardaş!

Oxusam və in yəkadu, olusan məsun xətərdən,
Görünübdü çox kəramət o kəlami-müxtəsərdən,
Əsərü xassi saxlar səni çeşmi- bəd nəzərdən,
Zəfərü-nəzər yetişməz belə xətti-xalə, qardaş!

Ola indi gəl Züleyxa qıla Hüseyninə nəzarə,
Necə Yusifi alıbdır elə də satar dübarə,
Min ilə əlaqə ciddən yetirər bu gül üzarə,
Ürəyində eşqi-Yusif yetər inhilalə, qardaş!

Yetiribdi çox bilirsən sənə murği-del əlaqə,
Belə sən də razı olma, yanam atəşi fərağə,
Əli indi ki, gedirsən məni birdə al qucağə,
Öpüm eyləyim camalın yetişəm vüsalə, qardaş!

Əli nazımı çəkərdin, kimə indi eyliyim naz,
Bacı qardaşın adıyla olur dəhridə sərəfraz,
Gedə qardaşı əlindən bacının cəlalı olmaz,
Pozular cəlalı cahı yetişər zəvalə, qardaş!

Səfər üstə xoşdu Qur`an edəsən əgər tilavət,
Ola müshəfi Peyambər sənə hər bəlada hail,
Görə var yanında Qur`an edə bəlkə rəhm qatil,
Səni əfv edən kitabi-həqq layəzalə, qardaş!

Yola düşsə hər müsafir belə rəsmidir bəradər,
Səfər üstə ağlamazlar ki, məbad ola mükəddər,
Bacılar dua edərlər, dalısıyca su səpərlər,
Su yoxumdu etməyim mən necə ahü-nalə,
qardaş!

## *Əli Əkbərin zəban halı*

Fərqi-Əkbərdən ki, dəydi rəzmidə xəncər yarası,
Tazələndi şahi-dinin qəlbidə Heydər yarası.

Üz tutub səmti-xiyamə səslənib Əkbər həman
dəm,
Çatdı məqsudə zəbihin ey Xəlilullah ə`zəm,
Gəl əlac et gün qabağında sızıldar oxlu sinəm,
İsti qum üstündə gün dəydikcə ğur eylər yarası.

Ərşi-zin üstə zamani ki, baba, toprağa endim,
Cəddim istiqbalə gəlmişdi ayağına döşəndim,
Sən də gəl ey şah, necə gör doğranıbdı bənd-
bəndim,
Peykərimin göstərir bir aləm digər yarası,

Oğlunun aldı səsin ta xeymədə şahi-şəhidan,
Qəflətən təğyir tapdı haləti oldu pərişan,
Şah əsəfli halət ilə səslədi ləbbeyk Əli can,
Sinəmə ey kaş gəlsin sinəin var hər yarası.

Şəh, süvari-mərkəb oldu gəldi meydani-qitalə,
Səslədi oğlun nə qədər gəlmədi səs, etdi nalə,
Nagəhan şəmsi-vəla saldı nəzər bir məh cəmalə,

Baxdı gördü məh üzündə kövkəbə bənzər yarası.

Əkbəri görcək Hüseyn qan içrə, gör nə halə düşdü,
Can dedi guya balayla toy otağında görüşdü,
Zülmə bir bax Əkbərə şah ağladı, düşmən gülüşdü,
Qəlbini qan etdi tə`ni düşmən kafir yarası.

Rəxt şahanə quru yer üstə torpağa büründü,
Dizdə taqət olmadı getsin üzü üstə süründü,
Yetdi ta cavan oğul balininə qəlbi döyündü,
Başa vurdu görcəyin var başda bir xəncər yarası.

Qanlı torpağı silib bir halətilə üz-gözündən,
Olmasaydı gər imamət, səbri getmişdi özündən,
Ondakı əhvalı vazehdir Hüseynin öz sözündən,
Həşrəcək getməz, buyurdu, sinədən Əkbər yarası.

Əhli-məna min il ağlar zikr olan vəqtə bu möhnət,
Eylə halda səslənərdi ibni-Sədi pəst fitrət,
Ya Hüseyn bu gündən ötrü mən dedim gəl eylə beyət,
Dəyməsin ta qəlbinə fərzəndi gül peykər yarası.

Ey Hüseyni ki, olubsan del yarasından mükəddər,
Münzəvi də şikvə edər bu müsibətdən mükəddər,
Vardı bəzi şum ağızlarda eylə məşmum dillər,

Qəlbimi azürdə eylər nizədən bədtər yarası.

## *İmam Hüseynin (ə) Əli Əkbərə zaban halı (Sinəzən)*

Quru yerdə nəqşeyi-qamətin, eyləyib qiyamət, oğul Əli,
Evimi yıxıb, belimi büküb, belə sərvi-qamət, oğul Əli!

Yetişibdi fərqinə bir yara, bürüyüb camalını tazə qan,
Dirilikdən əl yumuşam Əli, başınə bu yarə dəyən zaman,
Məni öldürür sənin ölməyin, nə lüzumu öldürə kufiyan,
Bu başındakı yara mərgimə çox edər kifayət, oğul Əli!

Edələr şikaf bu sinəmi, o qədər ki, qəlb ola aşikar,
Ürəyimdə onda baxan görər, başımın yarasının əksi var,
Gələ başa hər nə bəla, bəli onu zəbt edər deli dağidar,
Ürəyimdədir, bədənində var nə qədər cərahət, oğul Əli!

Deyirəm yatıbdı bu gözlərin hələ seyri-aləm xab edər,
Gözünün yumulmağı ya oğul, mən binəvaya cavab edər,

Belə ki, yaman günə qalmışam məni bəlkə özgə
hesab edər,
Görürəm göz açmısan, eylirəm bu qədər səmacət,
oğul Əli!

Bu qoşun şəmatət edir mənə başın üstə çox
oturanmıram,
Gülüşürlər ağlaya bilmirəm, sevinirlər başa
vuranmıram,
Qabağımda düşmənim əl çalır, hələ mən ayağa
duranmıram,
Nə belimdə tabi-qiyam var, nə dizimdə taqət,
oğul Əli!

Nə rəvadı mən günə oxşadam üzün ey cavan
mələk siyər,
Azalar şüaü-ziyası çun, günə hər göz eyləsə çox
nəzər,
Vəli bu camala baxanda mən görürəm işıqlanır
bəsər,
Gözümün ziyasını artırır belə bir məlahət, oğul
Əli!

Məni nimə can eyləyib qəmin, bilirsən özün də
bu nöktəni,
Görsən ki, gəlmir dizlərim, necə xeyməyə aparım
səni,
Dur ayağa tut əlimi, Əli, sən özün xiyamə apar
məni,
Qocalıq zamanıdı eylə öz atana himayət, oğul
Əli!

Ərasati-həşridə ya Hüseyn, ata oğlunu itirən zaman,
Üzü qarə Münzəviyə məgər kim hay-hudə verər cinan,
Nə ola şahzadyəi-ə`zəmə o, zaman məni verəsən nişan,
Deyəsən o rusiyəhə gedib-qil, özün şəfaət oğul Əli!

## *İmam Hüseyn (ə) Zeynəbə zəban halı*

Gəl Əkbərim boyandı qana Minada Zeynəb,
Bu parə-parə nə`şin gətdim əbadə, Zeynəb!

Nə`şin qum üstə tapdım, fikr et nə halə qaldım,
Düşdüm yerə süründüm, başın diz üstə aldım,
Hey səslədim oğul vay, nalə siphərə saldım,
Səs vermədi səsimə meydanda başa çaldım,
Qoydu məni oğulsuz bu şahzadə,Zeynəb!

Gördüm əmmaməsindən şəhla göz süzür qan,
Bildim vurublar yara başdan bu qovmi- üdvan,
Baxdım o başa vurdum başıma, etdim əfğan,
Gördüm qılınc yarasın çıxdı atam yadımdan,
Bu dərdə yandı qəlbim ondan ziyadə, Zeynəb!

Dəymişdi bəs ki, yarə bu qaməti-rəsayə,
Əzası parə-parə düşmüşdü bu Minayə,
İllət odur ki, nə`şin bükdüm belə əbayə,
Uf ruzigarə, lənət bu ləşkəri cəfayə,
Düşdüm əcəb bəlayə bu Kərbəladə, Zeynəb!

Qana dönüb sirişkim qəlbim cərahətdən,
Bacı aman bu qövmün tə`nü şəmatətindən,
Çəkdikcə Əkbərimin ox sərü-qamətindən,
Mən ağladım bu ləşkər güldü şəqavətindən,
Heç olmadı mürüvvət qovmi-cəfadə, Zeynəb!

Mən höccətəm yer üzrə Xəllaqe Zülcəlalə,
Səbri-imamət ilə gör qalmışam nə halə,
Neylər bacısı baxsa bu məh-cəmalə,
Əkbər deyib ölüncə var həqqi etsə nalə,
Bacıya olma mane vəqti bukadə, Zeynəb!

Gəl gör çıxıbdı ruhu ya ki, gedib özündən,
Sil mə`cərinlə əvvəl qan laxtasın gözündən,
Dindir əgər danışsa sən agah ol sözündən,
Bacını səslə gəlsin öpsün qardaş üzündən,
Bundan sonra öpənməz nuki-cidadə, Zeynəb!

Qurbətdə guşə-girəm, çun Munzəvidir  adım,
Daim sənə Hüseyn can, nohə yazar midadım,
Ətfalüvə əgərçe var şükrü-e`tiqadım,
Dünya keçər və lakin çox səxt olar mə`adım,
Tapşır mənə şəfaət etsin cəzadə, Zeynəb.

## *Hüseynin (ə) Zeynəbə Əli Əkbər üçün zəban halı*

Doğrandı balam tapdı işim xatəmə, Zeynəb,
Də`vət eylə əhli-hərəmi matəmə, Zeynəb!

Sə`d oğlu Hüseyni necə gör qoydu müəttəl,
Baş açmağa, yas tutmağa ol sən özün gəl,
Aç qanlı əbanı ikimiz ağlayaq əvvəl,
Növrəstə cavan öldü, qocalmış ata qaldı,
Yumdu gözünü gözlərimin nurunu aldı,

Çaldı əl-ayaq can yetişib qanlı dodağa,
Mən ki, başı üstdən daha dura bilmirdim ayağa,
Öldü balam, Əbbas əmisi aldı qucağa,
Həsrətlə gözüm qalıbi bicana baxırdı,
Torpağa əbadan tökülən qana baxırdı.

Qurban kəsilər yoxdu sözüm kuhi-Minada,
Bu qədər cərahət görünüb hansı fədada,
Az yarəsi olsaydı gətirməzdim əbada,
Çoxdur yarası, heç birinin çarəsi yoxdu,
Başında olan yarəsi tək yarəsi yoxdu.

Bu qəmli xəbər xeymədə hər kimsəyə çatdı,
Pişvaza çıxıb əşgini xuni-delə qatdı,
Hər kəs yetişib qanlı əbaya Əlin atdı,
Ey vay Əli Əkbər səsi əflaka dayandı,
Tez huşa gəlib qəşş eləyən qızlar oyandı.

Güllər o pərişan çəmənə solmağa gəldi,
Ol- qanlı ürəklər yenə qan olmağa gəldi,
Su fikrini atdı hamı baş yolmağa gəldi,
Göz məşgini xunabilə doldurdu susuzlar,
Az qaldı müsibətdən özün öldürə qızlar.

Bə`zisi o qan ilə dolan gözlərin öpdü,
Bə`zisi dedi can, yaralı peykəri öpdü,
Bir xırdaca qız durdu onun əllərin öpdü,
Göz yaşlıların fe`linə, rəftarına baxdı,
Qanın götürüb əmməsi tək zülfünə yaxdı.

Əyləşmişdi övrət-uşaq qəlbi şikəstə,
Əbbasilə durmuşdu cavanlar ayaq üstə,
Oxşardı o növrəstə gülü hər iki dəstə,
Bir dəstə ayaq üstə deyirdi Əli eyvay,
Fövrən oturanlar da deyirdi ona lay-lay.

Çox şiddətlə ağladı Əbbasi-vəfadar,
Guya dilə gəldi eylədi bu sözü izhar,
Almağa sənin qanını şəmşirim, əlim var,
Bu eşqdəyəm dərdinə dərmanım olaydı,
Qardaşlarımla Əli,qurbanın olaydım.

Qasim də dilə gəldi axan göz yaşı üzdə,
Ayrılmağın imkanı yoxdur dedi bizdə,
Biz bahəm olaydıq gərək indi ikimizdə,
Sənsiz mənim aləmdə Əli, həmdəmim olmaz,
Amma sənilə yan-yana yatsam, qəmim olmaz.

## *Hüseynin Əli-Əkbərə zəban halı*

Qan yaxılıb əllərinə şəhidim, şəhidim,
Noldu şirin dillərinə şəhidim şəhidim,

Ömrünü xəncər yetirib təmamə,təmamə,
Parçalanəb başda yaşıl əmamə,əmamə,
Dur səni Əkbər, aparım xiyamə,xiyamə,
Ağlaya nisgillərinə şəhidim,şəhidim.

Xaliqi-aləm özüdür güvahım,güvahım,
Rəhmət idi düşmənə hər nigahım,nigahım,
Haqq demişəm fateh olar sipahım, sipahım,
And ola kaküllərinə şəhidim,şəhidim.

Səf çəkən ətrafıma ox vurandı,vurandı,
Əşgim əli surətimə rəvandı,rəvandı,
Qanına meydanda üzüm boyandı,boyandı,
Yatma gedək ellərinə şəhidim,şəhidim.

Vay bala cismində varın cərahət, cərahət,
Düşməni-xunxar eləyib ədavət, ədavət,
Saldı səni Hüseyn yola səlamət, səlamət,
Şanə vurub tellərinə, şəhidim, şəhidim.

Qan verir ey hökmi-Xuda fədası, fədası,
Peykərinin torpağa hər yarası, yarası,
Gəldi anam Fatimənin sədası, sədası,
Ağlamışam güllərinə, şəhidim, şəhidim.

Verdi sənə tirü Sinan əziyyət, əziyyət,
Oldu nəsibin gözəlim şəhadət, şəhadət,

Ey gülü-əhmər yetişib müsibət, müsibət,
Qəmzədə bülbüllərnə, şəhidim, şəhidim.

Cəddimə bənzərdi gözəl camalın, camalın,
Mərdümi heyran elədi kamalın, kamalın,
Yandırır indi hamını məlalın, məlalın,
Uf ola qatillərinə, şəhidim, şəhidim.

Cameyi-ənduhü-qəmə büründüm, büründüm,
Yeddi qədəm peykərinə süründüm, süründüm,
Başın üstündə gəlib göründüm, göründüm,
Yandı ürək qəmlərinə şəhidim, şəhidim.

Yarəni gördüm ki, üzüm saraldı, saraldı,
Qəlbidə ənduhü-qəmim çoxaldı, çoxaldı,
Gözlərimin nuru oğul azaldı, azaldı,
Ağladı müşküllərinə, şəhidim, şəhidim.

## *Bayatı*

Nə qədər Əkbərim sağıydı, Zeynəb,
Bağım səfalı bir bağ idi, Zeynəb,
Yıxammazdı ox məni qumlar üstə,
Məni yıxan onun dağıydı, Zeynəb.

## *Həzrət Qasimin (ə)zəban halı cuşi*

Gəl dadə, yetib başə əcəlim, can üstəyəm, ey cananım əmi,
Gəl surətini qoy bir də görüm, qurban gözünə bu canım, əmi.

Üç yaşımda mən qaldım atasız, Yəsribdə mənə sən oldun ata,
Qardaş balasın, haşa əmisi bir ləhzə əmican gözdən ata,
Sən olma riza xun delini, göz yaşə balın həsrətlə qata,
Gəl qoy qədəmin bir an başıma, yetə peymanım, əmi.

Almış əlinə üryan qılıncın, kəssin başımı cəlladi-dəğa,
Qanlı gözümü qoyma nigaran imdadıma gəl, qurban adına,
Mən müntəzirəm lütf eylə sən, bu qanə batan ləblərdə dua,
Xaki-qədəmin xeymündə öpəm, olmadı mənim imkanım, əmi.

Bir yarəli təhyu tək yıxılıb, bu qanlı Minada qəmli balan,
Səyyadə düçar oldu əmican, bu dəşti bəladə qəmli balan,

Ney misli Nəva eylir bilisən, bu dərdə fətadə
qəmli balan,
Hicrində sənin ərşə ucalıb hər ləhzə mənim
əfğanım, əmi.

Can üstə görüb bikəs balasın, qətlayə babam
tahada gəlib,
Alsın dizinə qanlı başımı mə`nada anam Zəhra
da gəlib.
Məzlum atam ilə cəddim Əli bu qətligaha imdada
gəlib,
Gəl pənctəni təkmil eylə sən, ümidim əmi,
cananım əmi,

Gəl şəhdü-şəhadət nuş edirəm, xoşdur görünə
məhbuba həbib,
Hicrana özün yaxşı bilirsən, bir ləhzə də, əmi,
yox məndə şəkib,
Balinimə sən qoysan qədəmin,qurbanınam ey
ruhani təbib,
Rahat verirəm cananıma can, çün həsinin olar
dərmanım, əmi.

Açdım eylə ki dünyaya gözüm, can vəqfi-rəhi-
Qur`an elədim,
Birdən on üç il bu saətə, mən qəlb evini alqan
elədim,
Peymanə vəsli meyl eləyib, peymanımı mən
payan elədim,
Təlx oldu mənim əvvəldə günüm, şirintərimiş
payanım əmi.

## *Əmisi Hüseynə (ə) xitabı*

Ey atamdan mehriban,ey qəmgüsarım gəl, əmi,
Düşmüşəm meydani-qəmdə tacidarım gəl, əmi.

Eşqinin sərgəştəsi vəsl aləmi mədhuş olur,
Gəlməsən tiri-fəraqə qəlbi-zarım tuş olur,
Qıl qədəm rəncə çırağı Müctəba xamuş olur,
Ver şərəf qurbanə artsın iftixarım, gəl, əmi.

Sən xəlili-eşqisən bu yer Minayi-eşqidir,
Yarə xatir yaralanmaq xoş səfayi-eşqidir,
Olsa məqbul Xuda Qasim fədayi-eşqidir,
Xəncər altda nami-canandır şüarım gəl, əmi.

Ey Süleyman, qüssədən gəl xatirim azad ola,
Murəbi miqdarə bax qəmli könül ta şad ola,
Əkbərə qoşdun məni-zari evin abad ola,
Gözlərim qurban çoxaltdın e`tibarım, gəl, əmi.

Yaxşı bəhrə verdi bu az ömrünün sərmayəsi,
Başıma üç sinnidən düşdü səadət sayəsi,
Bəxtə bax öldüm əmoğlum Əkbərin həmpayəsi,
Şə`nimi artır bu saət şəhpərim, gəl, əmi.

Fikr qılma gəlməyindən ərzi-hacətdir nəzər,
Olsa zəhmətdə mənə əxzi-səadətdir nəzər,
Məqdəmin bus eyləmək birdə ziyarətdir nəzər,
Candı payəndazi-məqdəm əldə varım, gəl, əmi,

Qatilim namərdidir, yoxdur ümidim bir kəsə,
Zülmidə tə`cil edirsən gəlməmiş başım kəsə,
Ömrümün gülzarına az qaldı badi-qəm əsə,
Az qalır dönsün xəzanə növbəharım, gəl, əmi.

Halıma yox bir kəsim səndən sora sən tək yana,
Bu yanar oddan özün gəl Qasimi çək bir yana,
Xeyməmə həml eyləsən qoy Əkbər ilə yana-
yana,
Çün olub onuyla mənim gəştü-güzarım, gəl, əmi.

Lütf edib gəlsən bu saət başım üstə məqtələ,
Gözləri aydın görürsən, var çətin bir mərhələ,
Düşmənimdə yox mürüvvət kakilim almış ələ,
Suzi-ahımdan əyandır hali-zarim, gəl,əmi.

Mən yetiməm, xahişim salma yerə etmə məlul,
Başım üstə baş açıblar Murtəza ilə Bətul,
Sən buyursan Müctəba qurbanlığa oldu qəbul,
Səd bərabər artırar şə`ni-vüqarım, gəl, əmi.

Son nəfəsdə cani-Əsğər qalmayıb məndə şəkib,
Mərhəmət eylə mənə didarın olsun bir nəsib,
Aşiqəm mən, dərdimin dərmanı sənsən ey təbib,
Yoxsa bu müşgül, sənlə nə karım, gəl, əmi.

## *Səkinə anası Rübabə xitab*

Durub Səkinə ağladı qucaqladı anasını
Dedi az ağla dərdinin gəzim tapım dəvasını,

Çıxıb oturdu xeymənin dəriçəsində didəmər,
Gözün silərdi dəmbədəm edərdi yollara nəzər,
Qaraltıdan zühur edib başında xonça bir nəfər,
Əşayiri salam ilə neşan virib vəfasını.

Qoyubdu xonçanı yerə öpübdü Zeynəbin əlin,
Dedi oyat qəza yesin bənati-xətmi mürsəlin,
Danışdı macərasının həm axırin həm əvvəlin,
Edibdi vəsf o gordüyü yaralının nümasını.

Verib qüzarişin çıxıb gedəndə xeymə-gahidən,
Görüb ki, bir çadır qurub Səkinə dudi-ahidən,
Yol üstə əyləşib axır sirişgi ruyi mahidən,
Əyildi öz balası tək öpüb Hüseyn balasını.

Dedi yemək gətirmişəm gər olsa meylü-rəğbətin,
Cavab verdi bir şərt ilə qəbulidir bu xidmətin,
Varımdı bircə xahişim yetişsə dəsti-himmətin,
Anam Rübab qəlbinin sağaldasan yarasını.

Dedi kiminə külfətin gərək nə xidmət eyləyə,
Buyurdu sürətilə sən özün yetir qəbiləyə,
Qəbilədən bir ac yatan uşaq gətir bu xeyməyə,
Anam Rübab əmizdirə öz oğlunun qəzasını.

Dedim xanım, xəcalətəm xəcil gedən gələnməyib,
Xəyal etmə külfətin sifarişin bəyənməyib,
Günortadan qəbilənin uşaqları süd əmməyib,
Süd ilə şirxarələr kəsibdi etinasını.

Nə vardı bilmirəm göyün tutub əza ay- ulduzu,
Nə var bu gün dönüb suyun dadı qəzaların duzu,
Uşaq ki, səhlidir hələ süd əmməyib qoyun-quzu,
Quzuları mələr qoyan mələr qoyub anasını.

İkinci müşkülüm budur əgər tapılsa südəmər,
Rübabə baxma hər ana baladan əl çəkər məgər,
İməkləyən balanı gör gecəylə kim qonaq verər,
Ki, sinə-pərvər eyləyib hərə öz aşnasını.

## *İmamın Əli Əsğərə zəban halı*

Qoymaram məzarə Əsğər, səni ta qiyamət olsun,
Boğazın biçildi bari, bədənin səlamət olsun.

Bilirəm əgər bu çöldə səni qoysam məzarə,
At ayağı altda nə`şün olar onda parə-parə,
Vurular başın cidayə, yıxılar evim dübarə,
Deyiləm riza ərəbdə belə bidət adət olsun.

Ox atan görüm şil olsun, bu qədər şəqavət olmaz,
Hədəf eyləyib boğazın belə bir ədavət olmaz,
Boğazındakı yaran tək görürəm cərahət olmaz,
Necə tab edim, nə növi ürəyimdə taqət olsun.

Sənilən gərək qoyam mən o qədər dodaq-dodağə,
Tökülə sirişgi çeşmim sönə atəşi-əlaqə,
O qədər öpəm gərək dil yetə hədd iştiyaqə,
Mənə şəhdi-nab məqsəd anana niyabət olsun.

Şühədadan olsun Əsğər, gərək ali imtiyazın,
Odur eylərəm ziyarət, öpərəm bu gül boğazın,
Qoyaram yerə cənazən, qılaram özüm namazın,
Sənə imtiyazi-ali, mənə də ibadət olsun.

Qoyacaqlar dəfn edəndə səni sinəmə dübarə,
Sənilə gərək yetəm mən şərəfi-hüzuri yarə,
Əlim üstə mən aparam səni məclisi-nigarə,
Gərək aşiqin əlində güli ba təravət olsun.

Xoş olar təfaxür eylər analar oğul sözündən,
Danışmadın sən ananın iraq gözündən,
Səni görsə mən görən tək gedər onda o özündən,
Odu qorxuram qəmindən anana həlakət olsun.

Ananı məzəmmət etmə xətti-qəm çəkib nişanə,
Üzünü xəraş edərdin qoyub əllərin qəmatə,
Dolaşıb qəmati-bəndi səni eyləyib əhatə,
Əl-ayaq çalanmısan ta sənə mərg rahət olsun,

Dəmi-həşr olanda nə`şin əlim üstə saxlaram mən,
Qanının bahasın allam, hamını bağışlaram mən,
Sənə hər kim ağlayıbdır gərək onda axtaram
mən,
Olara bu pak qanın səbəbi şəfaət olsun.

Əli Əsğər, ey mübarək adı zeyni-bəzmi-matəm,
Vey olan gedayi-dərğəh sənə xosrovani-aləm,
Mən Münzəvidən etmə nəzərü-təvəccühün kəm,
Ki, bir az sözümdə ruhü-nəmək fəsahət olsun.

## *Anası Rübab*

Susuzdan saralan gül Əli kim dərdi səni?
Niyə dərdi, niyə bəs üstümə göndərdi səni?

Güldə xəbəridi əgər dərdi niyə saxlamadı,
Üstümə yollayacaqmış niyə saf yollamadı,
Gördü rəngin saralıb xoşlamadı parçaladı,
Etdi məndən də özündən də əməl gərdi səni.

Rənginə, ətrinə xatirdi gülün müştərisi,
Ox biçib soldu Rübabın gül nilufərisi,
Sağ-sola parçalanıb öpdüyüm hülqün dərisi,
Bu hala qoydu südün dərdi, suyun dərdi səni.

Bağbanın suya satdı qanını Hərmələyə,
Şərti fəsxi yox idi istəməyən də bilə,
Pərpər olmuş gülü gətdi verə yorğun ləliyə,
Eylə yorğun xəllinin gözləri gözlərdi səni.

Gülü güldanda əkərlər verilər su o gülə,
Tutsa da tutmasa da rəsmidi yarpaq tökülə,
Altı aylıq gülidin Hərmələ döndərdi gülə,
Hər kəs olsaydı doyunca öpüb iylərdi səni.

Şəhri-Yəsrib becərən həzrəti-Taha gülüsən,
Qürbi-vəhdətdə solan rəbiyül-ə`la gülüsən,
Sən Hüseynin gülü, Zeynəb gülü, Zəhra gülüsən,
Ömrü zay olmuş anan sinədə bəslərdi səni.

Altı aylıq gülə ox üç, hər ox atan sinni də şəst,
Bildi hülqi gölu Zəhra dilinə etdi neşəst,
Ox biçəndə boğazı qoldan Hüseyn oldu şikəst,
Yaralanmış qola gül bərk elədi sərdi səni.

Suya qarğışçıdı müstəqbəlü-halü-mazi,
Nə südüm oldu, nə su oldu ölməyə razı,
Qələmin üç pər etmişdi Şüreyhi qazi,
Öldürən Hərmələ yox,qaziyi ləşkərdi səni.

İkini bir edib üç şöbəli peykan yarası,
Atdı fəvvarə kimi qan guya hülqün çalası,
Yaralı deyər sə`yilə həzrət Zəhra balası,
Can verəndə necə bəs qibləyə döndərdi səni.

Yalvarıram Əli qurbanın olum az cabala,
Yatmadın nə beşikdə, nə qucağımda bala,
Zindəginin şəhdidi gətdi zəhri qatdı bala,
Məni öldürmək üçün xeyməyə qaytardı səni.

Damara gərək baxıb qan ala mahir qan alan,
Almaz üç şöbəli peykanilə cani-can alan,
Bala Allahdır deyirlər şühədadan can alan,
O Hüseyn-dəndə Rübabdanda çox istərdi səni.

Yandım Allah balamı yandıranı yandırasan,
Qönçəmi qırdı mənim, rişəyi ömrüm qırasan,
Qəlbimə doldurub od, qəbrinə od qoldurasan,
Bizə Qur`andı din-xaliqi Əkbərdi səni.

Fələyin ki, bu qədər sabitü-səyyari var,
Ondan artıq ürəyimdə balamın yarəsi var,
Gördülər Fatimənin sən kimi məh parəsi var,
Gözilə oxladılar ləşkərin hər fərdi səni.

Sən ki, üç mərtəbə verdin Əli, dünyaya təlaq,
Ayrılanda dedim üç şöbəli oxdan gəz uzaq,
Gedisən babül-həvaic bala, Zəhraya qonaq,
Saxlayan sinədə Zəhrayi-mütəhhərdi səni.

Getdi qəm çəkdi yaxandan Əli, dünya əlini,
Qəmlərin qaldı çəkər həzrət Zəhra gəlini,
Nə gedərsən su dalıyca, nə qə hülqün dilini,
Qorxma sirab eliyən saqiyi-kövsərdi səni.

Raci, nökərlik adın sən haçan qoyubsan özünə,
Necə nökər sən ola, daş başına, kül gözünə,
Yövmi-məhşərdə sözün var baxalar ta sözünə,
Şayəd oddan çəkə bilsə Əli Əsğərdi səni.

## *Oxşama*

Oğul Əli, qəlbi qəmlə sıxaram,
Qatil evin ahım ilə yıxaram,
Doyunca ağlayammadım bu çöldə,
Əvəzini Mədinədə çıxaram.

Dərk etmədim işarəni doyunca,
Oxşamadım ox yarəni doyunca,
Dilsiz getdin sənə dil öyrətmədim,
Tərpətmədim gəhvarəni doyunca.

Könlüm istər sınan könlüm alan gəl,
Səhni-sərada qoyma tək qalam, gəl,
Üzü gülüş alanı səhər tək aydın,
Dodaqları baldan şirin balam, gəl.

## *Oxşama*

1

Qəm yeli əsər gedər,
Səbrimi kəsər gedər,
Hansı südəmər bala,
Anadan küsər gedər.

2

Göz yaşım rəvanədi,
Üzdə danə-danədi,
Köynəyin bu sinədə,
Həşrədək nişanədi.

3

Qanına batan Əli,
Məqsədə çatan Əli,
Nənəni ağlar qoyub,
Qəbridə yatan Əli.

## *Oxşama*

1

Sənə nolubdu balam,
Rəngin solubdu balam,
Oyan bir dur yuxudan,
Döşüm dolubdu balam.

2

Laylay balam, can balam,
Mən sənə qurban, balam,
Sən ağlayanda,oğul,
Gözüm ağlar qan, balam.

3

Balamı tanıram mən,
Hər sözün qanıram mən,
Yuxuda ah çəkəndə,
Od tutub yanıram mən.

## *İmam Hüseynin (ə) zəban halı*

Üz tutub nəhri-Fərat üstə dedi gəl, qardaş,
İndi Əbbas, uzun qolların hacətdi mənə.  Aparıb
qan əlim üstündə bu dilsiz balanı,
Lazım hər vəqtidə əs-saə himayətdi mənə.
Mən xəcalət zədəyəm xeyməyə qardaş, sən apar,
Sənin olmağın əqəllən, yenə qüvvətdi mənə.
Yeddi qardaş səsi mə`nada gözəl qardaşına,
Bədəni titrədi, ərz etdi səsin çatdı mənə.
Əlin üstündə balan aləmi yandırma, Hüseyn,
Hər qəmindən ağır əs-saə bu möhnətdi mənə.
Yox əlim yarəli yorğun balanı əldən alam,
Belə fikr etmə Hüseyn, zərrə əziyyətdi mənə.

Yaralı sinəmin üstə qoy Əli Əsğərini,
Oğluna həmdəm olum indi ki, fürsətdi mənə.
Bəlkə əfv eyləyə şərməndə Əbəlfəzlia,
Yoxsa hər bir baxışı şərmü-həlakətdi mənə.

## *Rübabın zəban halı*

Qəlb odun etmir xamuş mənim ağlamağım,
Qüssəmi ya ki,azaltmaz bu ürək dağlamağım.
Mənə çox nisgil olub əllərini bağlamağım,
Razıyam sən məni xidmətdə gəlib saxlayasan,
İxtiyarında qoyam sinəmi dırnaqlayasan.

Sübhəcək mən oyaqdım Əli uzlduzlar ilə,
Baş-başa vermişdim oğlum, oğulsuzlar ilə,
Boyunu oxşamışam mən atasız qızlar ilə,
Yandıqca qəmivə qəlbi Rübabın alışıb,
Yatmayıb,Hərmələnin üç pər oxundan danışıb.

## *İmam Hüseynin (ə) zəban halı*

Ağlama Əli, saxla naləni ruzi-məhşərə, ey bizəban oğul,
Zəhərli oxa tab edənməzsən, eyləyib səni natəvan,oğul.

Əlləri şil olsun o zalımın, oxladı qucağımda hülqüni,
Çox cəsarətlə dil açmamış, Hərmələ sənin kəsdi nitqini

Halına neçə baxəbər edim madərin Əli Zeynəb əmməni
Gözlyəir səni xeyməgahidə indi madəri-mehriban, oğul.

Yoxdu bir kəsim nə`şini ala bu qana bələnmiş qucağımdan,
Mən səni səlamət gətirmişəm bu məkana Əsğər xiyamidən,
Getmərəm xiyamə, yanır ürək, olmuşam xəcalət Rübabidən,
Yandırır sənin nisgilin məni, eyləmə əninü-əfğan, oğul.

Sinə Rübab bəlakeşə virdi-vəsli ümidi saçmadın,
Od vurar deli-por şərarimə, çun ana deyib bir dil açmadın,
Xırdaca uşaqlar kimi Əli, sən mənim qabağımda qaçmadın,
Biçdi hülqünü Hərmələ atan tiri-üç pər cansitan oğul.

Şahi-Kərbəla o zaman durub xəstə halilə yetdi xeyməyə,
Əllərində Əsğər cənazəsi səs gəlib Hüseyn, getmə xeyməyə,
Qaytar öz əlinlə məzar qaz poşti-xeymədə, fovri dəfn elə,
Görsə Əsğərin binəva Rübab səsləyər deyər dildə can oğul.

## *İmamın zəban halı*

Zeynəbim, gəl al əlimdən təşnə ləb qurbanı
gətdim,
Əllərin üstündə indi Əsğəri-peykani gətdim.
Qızıl qana batdı - oxa gəldi yatdı.

Dilsizim gördüm ətəşdir, istədim su əhrimənden,
Su içib aram ola şayəd dedim rəncü mühəndən,
Hərmələ şərm etmədi amma nə xaliqdən nə
məndən,
Üç pər ox saldı nəfəsdən, ahuyi-Zəhranı gətdim.

Ox dəyib diksindi fövrən gözlərin açdı sitarəm,
Bir oxa etdi təbəssüm, bir mənə baxdı həzarəm,
Söylədim yat dincəl oğlum, dərdinə yox ayrı
çarəm,
Südəmər qurbanımın çıxdı əlimdə canı, gətdim.

Zəhməti-eşqə dözüb mən etmədim haşa gilayə,
Eylədim töhfə tədarük sahəti-qüdsi-Xudayə,
Qanını ucumda tutdum şövqilə səpdim səmayə,
Şirixarın qanı oldu eşqivin bürhanı gətdim.

## *Oxşama*

Mən Rübabəm, xanım Zəhra gəlini,
Dağıtdılar evimin get-gəlini,
Mən bilsyədim Əsğərim oxlanacaq,
Axır gecə bağlamazdım əlini.

Mən Rübabəm, taqətimi almayın,
Quzu qurbanımı yada salmayın,
Ey xanımlar bari bizə gələndə,
Qucağıza körpə uşaq almayın.

Mən Rübabəm, dərdim ələn olmadı,
Başıma nə bəla gəldi bilən olmadı,
Şami-qəriban axşamı su içdim,
Döşümə süd gəldi əmən olmadı.

Ulduzum axdı getdi.
Qəlbimi yaxdı getdi,
Əsğərim ayrılanda,
Həsrətlə baxdı getdi.

Lay-lay gülüm ağlama,
Ürəyimi dağlama,
Yat anan qurban sənə,
Qılbimi çox dağlama,

Mən açmaram bu başımdan qarəni,
Bağlamadım peykan biçən yarəni,
Dayıların bir gün gəldi vətənə,
Tanımadı oğlu ölən nəni.

## *Rübabın zəban halı*

Səni etdi bu zəmanə oxun aşinası,lay-lay,
Bilirəm çox incidibdir boğazın yarası,lay-lay.

Bu gecə səhər olunca vay oğul demək mənimdi,
Qara torpaq üstü oğlum, mənim indi
məskənimdi,
Mənə qaldı qanlı qundaq ki, nişani-gülşənimdi,
Əli,sənlə getdi oğlum oynayan səfası, lay-lay.

Yorular qoşa şəbihim qəm əlində dil şikəstə,
Bu kəmənd cəm edibdir quru canı bəndə bəstə,
Necə bu fələk balanı həm ananı etdi xəstə,
Ucalıb xeymədə Əsğər ananın nəvası, lay-lay.

Balası yanında ahu mələşir gecə zamanı,
İraq oxçular gözündən dolanır bu Kərbəlanı,
Üzü gülməsin cahanda sənə üç pər ox atanı,
Qoy axan sirişkim olsun yaranın dəvası,lay-lay.

Əli, bu anan vətəndə dəxi kölgə yerdə qalmaz,
Əlinə sərin su camın sənə xatir oğlum, almaz,
Dəxi bir də şali qırmız başına ölüncə salmaz,
Biləyin qanı olubdur başımın hənası, lay-lay.

## *İmamın zəban halı*

Qan ağlayan ox halına şeş mahə sərbazım bala,
Ey şahzadə Əsğərim, novrəstə canbazım bala. [2]

Sənsiz tükəndi taqətim səbrü-qərarım, ey oğul,
Ey bülbüli-baği-irəm ahu maralım, ey oğul,
Dil açmamış oldun Əli nizə yaralım, ey oğul,
Lay-lay deyəndə söylərəm şeş mahə canbazım
bala.[2]

Çox nisgil oldu madərə boş beşiyə lay-lay çala,
Bu qövmi-kinəcu səni gör nə salıb yaman hala,
Qorxum budur düşmən bizi bundan da bəd hala
sala,
Rəhm et anan bi yavərə şeş-mahə sərbazım, bala.

Ağlar qalıb Zeynəb bibin cahü-cəlalı neylirəm,
Rə`şə salıbsan halıma artıq məlalı neylirəm,
Bilməm nədən oldun oğul başı bəlali neylirəm,
Gələm belə dərdü-dilə şeş mahə sərbazım bala.

Gülzari-madərdən Əli, bilməm nədən döndün
bala,
Oxladı hülqün Hərmələ qundağidən çöndün,
bala,
Sən məş`əli-purnuridin, nə oldu sən söndün bala,
Bağrımı etdin ləxtə qan şeş mahə sərbazım bala.

## *Rübabın zəban halı*

Nazlı dilbərim lay-lay,mahi-müntəzirim lay-lay,
Oxlanan su üstündə dilsiz Əsğərim lay-lay$^2$.

Üç gecə gündüz ətşan qaldın, ey günü qarə,
Dırnağın yeri qalmış, etdi sinəmi yarə,
Əfv eylə məni oğlum, tapmadım sənə çarə,
Şahidim bu əhvalına həyyi-davərim,lay-lay$^2$.

Mən sənə oğul, lay-lay nə ümidilən çaldım,
Gülmədi üzüm əfsus, qara günlərə qaldım,
Ölmədim səni ətşan xeymədən yola saldım,
Sən gedən yola həsrət baxdı gözlərim, lay-lay$^2$.

Haqq yolunda can verdin caninə nənən qurban,
Əkbər ilə həm payə şə`ninə nənən qurban,
Su kimi axan qanə, caninə nənən qurban,
Gül kimin solan rəngi, qonçətərim lay-lay$^2$.

Yaxşı vəqtidə oldun şahi-din həvadarı,
Sərbəsər boyanmışdı qanə yarü-ənsarı,
Oldun axır səfdə xırdaca ələmdarı,
Tək qalanda meydanda şahi məhşərim lay-lay$^2$.

Qəlbinə fələk bizri-dərdi-mühnəti əkdi,
Baxdı bir Fərat üstə bildi yarı yox, təkdi
Tiri teşnə hülqündən yumdu gözlərin çəkdi,
Ağladıbdı dünyanı qəmli rəhbərim lay-lay$^2$.

Qanını atan əvvəl ovcuna alıb baxdı,
Yandı qəlbi göz yaşı çeşmələr kimi axdı,
Qanını böhranda ağ məhasinə yaxdı,
Ağladı dedi dilsiz haqqa məzhərim lay-lay[2].

Həzrət Qasımın (ə) anası Sürəyyənin zəban halı
Qan bəstərində yatmısan naz bala,
Naz eyləsən etgilən az, bala,
Ölsün nənən bu günləri görməsin,
Dur öz əlinlə qəbrimi qaz ,bala.

## *Qasimin (ə) anasına zəban halı*

Rəzmigahda qopubdu çox hay, nənə,
Dərdimi birbəbir deyim say, nənə,
Yıxıldım torpaq üstünə yaralı,
Birdən dedim gəl hardasan, ay nənə.

Sitəm əli kəsib mənim çarəmi,
Sal başına bundan belə qarəmi,
Can üstəyəm gözüm səni axtarır,
Xoşdu nənə sən bağlasan yarəmi,
Səslə gəlsin əmin Hüseyn hərayə,
Alıb məni leşkəri-kin arayə,
Həml eləsin peykərimi xeyməyə,
Əkbər kimi yıxılmışam Minayə.

## *Hürrün zəban halı*

Hürr-şərməndəyəm ey şah pənah axtarıram,
Gəlmişəm dərgəhüvə izzətü-cah axtarıram.

Mən həmin zalım idim zülmidə tüğyan elədim,
Fatimə qızlarını qəlbi pərişan elədim,
O cəsarət ki, Hüseynə məni-nadan elədim,
Gəlmişəm xətti-aman, əfvi-günah axtarıram.

Yetirib şaha deyin bəndəyi-şərməndə gəlibə,
Ya Hüseyn, Hürri-sərəfkəndə pənahəndə gəlib,
Qapına bir üzü qarə əli boş bəndə gəlib,
Halıma guşeyi-çeşminlə negah axtarıram.

Görmədim ali-Yəzidin səri-rahində şərəf,
Nə əmrində ədəb var, nə sipahində şərəf,
Nə libasında fəzilət,nə kulahində şərəf,
Mən bu dərbari-şərafətdə kolah axtarıram.

Mən əzəl fikr elədim iş belə gəlməz qabağa,
Kimdi şəmşir çəkə dəvət olunmuş qonağa,
Məni əfv eylə bağışla, yolunu kəsdim ağa,
İndi babi-kərəm və rəhməti-rah axtarıram.

Atanın həqqinə verrəm qəsəm ey şah səni,
Qapına qan eləyib gəlmişəm əfv eylə məni,
Siz şərəf mə`dənisiz, rədd eləməzsiz gələni,
Tövbəyi-rusiyah və namə siyah axtarıram.

Dərdimin çarəsini səndə fəqət görrəm ağa,
Daməni vəslini əldən necə mən verrəm, ağa,
Mən əgər Hürrəm, elə bu qapıda hürrəm ağa,
Üstüxani-kərəmin gah be gah axtarıram.

Gəlmişəm cürmü-xəta dəftərin əşkilə siləm,
Öpəm Əkbərin əlin, Əsğərə qurban kəsiləm,
Sən su verdin mənə yollarda,mən əlan xəciləm,
Rusefid ölmyəimi xahi-naxah axtarıram.

Məndən üz döndərib əsrarımı ifşa eləmə,
Küfrümü səfheyi-tarixidə imza eləmə,
Qapıdan qovma Hüseyncan, məni rüsvay eləmə,
Göz yaşım qana dönüb, sinədə ah axtarıram.

Gecə başından olan xəlqi-pərakəndə sənin,
Hər biri şə`ninə olmazdı bərazəndə sənin,
Bu qulamım sənin oğlum da sənin,mən də sənin,
Bu sınıq ləşkər mə`duduma şah axtarıram.

Şühədaya eliyibsən nə kəramət bilirəm,
Öz məqamın hamı eylib gecə rö`yət bilirəm,
Şühəda huri görüb, mən səni cənnət bilirəm,
Qeybə iman gətirib əmnü-rifah axtarıram.

Ar ola cənnəti sənsiz biri gər yadə sala,
Gedirəm qoyma bu nisgil vəli qəlbimdə qala,
Göndər Əbbası bacından mənə hilliyət ala,
Özümün gəlmir üzüm lütfü səfa axtarıram.

## *Hürrün şəhadəti*

Minayə düşmüşəm Hüseyn, bədən yaralı,
Səni gözətləyir susuz ölən yaralı.

Əziyyət eyləmir mənim yaram bədəndə,
Əzizi-Fatimə, gözüm var indi səndə,
Dübarə istirəm səni görüm öləndə,
Biləm bu halı vardı bir bilən yaralı.

Gözümdən eşq malıyla məlalı atdım,
Sənin kimi özüm də əhli-əyalı-atdım,
Bu fəxr bəsdi ki, mənə məramə çatdım,
Bu və`dəgahi-eşqidir, bu mən yaralı.

Elə şadam ki, qəlbidə şəmim dağ olsun,
Ölüm tapdı nökərin, başın sağ olsun,
Məni bağışladın Hüseyn, üzün ağ olsun,
Nə qəm çəkər, nə eylər mühən yaralı.

Səni gözlətmirəm Hüseyn, üzümdə qanım,
Yara dəyibdi çox mənə, gedib təvanım,
Yetiş harayima ağa, çıxınca canım,
Yoluna vardı gözlərin dikən yaralı.

Gözəl adın olub mənim əcəb şüarım,
Sənin qapında ölmüşəm var iftixarım,
Səninlə Kərbəladədir yəqin məzarım,
Yox eybi olmasa mənə kəfən yaralı.

Bu yaralı başım o məh cəmala qurban,
Həqiqət üstə etdiyin xəyala qurban,

Minayi-həqqadə etdiyin vüsala qurban,
Mənə vurubdu nizə hər gələn yaralı.

## *Aşura gecəsinin növhəsi*

Az qalır gülşəni-Zəhra ola pər-pər bu gecə,
Dolanır xeyməléri Zeynəbi-müztər bu gecə.

Bu gecə gülşəni-Zəhrada çıxıb ərşə nəva,
Bülbülani şəhi-din şirə gəlib va əcəba,
Mürtəza itrətinə fələk xətər yazdı qəza,
Zarü-giryandılar övdladı Peyəmbər bu gecə.

Bu gecə gördü Hüseyn də Şühəda səflərini,
Bu gecə bacısı nəvaziş eyləyir Əkbərini,
Alıb ağuşə Rübab dilsiz Əli Əsğərini,
Ana püstanına dırnaq vurur Əsğər bu gecə.

Hər baxışda baxışın qəlbimə bir oxdu bala,
Baxsın sən üzümə,dildə sözün çoxdu  bala,
Əmirsən hey çəkilir çünki, südüm yoxdu bala,
Bələşib döşlərimin qanına əllər bu gecə.

Gah gözündən üzünə göz yaşını bağlayasan,
Anani yaxşı kabab eyliyisən, ağlayasan,
Balaca əllərlə sinəmi dırnaqlayasan,
Neylərəm çarə yoxumdur məni-müztər bu gecə.

Sən bala olma ətəş sən,su düşübdür yadına,
Nə südə vardı gümanım, nə də bir ` suya,
Necə mən indi deyim dərdimi Əbbas əminə,

Sənə bir cürə ala su o dilavər bu gecə.

Altı ayda məni sən yormamışdın bu sayaq,
Məni ağlatma əzizim gözümün əşkinə bax,
Gəl gedək mənlə ələmdar əminin məşkinə bax,
Sənə xatir özü məhzundu o sərvər bu gecə.

Anan ölsün üzünə su yolunu bağladılar,
Ürəyin qəmli Rübabın qəmilə dağladılar,
Südəmər bir qurbanı yaxşı qonaq saxladılar,
Su kənarında qoyub kufəli ləşkər bu gecə.

Gəh vurursan əlini ləblərə halın dolanır,
Baxır halına qəlbi ananın parçalanır,
Döşlərim qanı ilə dil-dodağın da boyanır,
Ürəyin şö`lə çəkir xoş getdi ləblər bu gecə.

Utanır səndən anan gahi qoyur üz eşiyə,
Alıram gahi qucağa salıram boş beşiyə,
Gecə vaxtı kimə dərdin anan izhar eliyə,
Təşnədir əmmələrin cümləsi xahər bu gecə.

Əsğər, ey babül-həvaic, özü həqq dinə fəda,
Kərbəlada boğazın parçaladı tiri-bicəha,
Balaca əllərlə dərdimə sən eylə dəva,
Bu Mühəmmədi dəva dərdinə istər bu gecə.

## *Müslümün əhvəlatı*

Kufəqə yalqız qoyanda qovmi üdvan Müslümü,
Eylədi çərxifələk zarü-pərişan Müslümü.

Çıxdı məsciddən kənara Müslüm bi əqrəba,
Bir kömək yoxdur yanında zikri ya Rəbbi- Xuda,
Fikr edib bu şəhridə oldum əcəb bi aşina,
Ey Xudayi-dadgər, axır pənah ol Müslümə,
Beyət etdi əhli-Kufə,bağladı yol Müslümə.

Qoydular yalqız o ali rəhbəri qovmi-dəni,
Naibi-Sultani-din heyran dolandı Kufəni,
Gah sərgərdan gəzir hər bir mahal kuçəni,
Bir pənahgahi-ədalət mərdi-aman axtarır,
Olmasa ev,cayigahi-hər fərdi insan axtarır.

Beyət sındırdı düşmən qəlbinə vurdu yara,
Ya kimə dərdin desin, heç bilmir getsin hara,
Gəldi axır bir məhəllə etdi orda ittika,
Bir nəfərdən rəhnümalıq etmədi qövmi-zəlal,
Durdu dərbəndin başında zarü-məhzuni-məlal.

Gördü bir övrət çıxıb dər bəndə baxdı gah-gah,
Çox sərasimə edib hər səmti dərbəndi nigah,
Baxdı Müslüm övrətə dildən çəkib bir sərd ah,
Övrət ərz etdi ağa, bu səhnəni bilmə rəva,
Get o yanda rahat ol, bu küçədə qalma, ağa.

Bilmisən sən bəs olubdu Kufə övzai xərab,
Üz tutub övrət o saət Müslümə etdi xitab,
Nə gedirsən, nə verirsən sən mənə axır cavab,
Şurişi qovğa salıbdı Kufəyə qövmi-dəni,
Get dayanma görsə vallahi tutar düşmən səni.

Qıldı fərmayiş yerim yoxdur qəribəm mən ana,
Tapmadım bir yer dolandım Kufə şəhrin hər yana,
Kufə şəhrində qəribəm qəmlərim gəlməz sana,
Söylədi övrət bu fikri gəlgilən başından at,
Gər qərib olsan, əqəllən get gilən məsciddə yat.

Qıldı fərmayiş ana, bir cür`ə su ver yanmışam,
Çun düşmən qalib olubdur yanmışam odlanmışam,
Bir iki saat qonaq et küçədə mən qalmışam,
Ta gecə olsun qaranlıq xanəni tərk eylərəm,
Düşmənim yatsın,çıxıb aya görüm mən neylərəm.

Əhsən əhsən Kufədə səd mərhaba bir övrətə,
Getdi təqdim eylədi su öz əliylə həzrətə,
Lə`n ola bu Kufə içrə mərdumi bi himmətə,
Səslədi Müslüm ana, sirab edibsən sən məni,
Hər iki dünyada Allah rusefid etsin səni.

Söylədi Müslüm sənin həqdür məramın,ey ana,
Müslümə oldu pənah şirin kəlamın, ey ana,
Söylə sən axır mənə kimdir imamın, ey ana,
Bu kəlamı övrətə Müslüm ağam qıldı əyan,

Gəldi nitqə övrət,dilin açıb əlhəqq-bəyan.

Ərz edibdir ey ərəb, Əhməd mənim
Peyğəmbərim,
Həm imam əvvəlin mövla Əlidir sərvərim,
Mən kənizi Fatimə, oğlu Hüseyndir rəhbərim,
Çün onun eşqində vallah qəlbimi qan eylərəm,
Canımı hər ləhzədə Zəhraya qurban eylərəm.

Kufədə bir neçə gündür qovzanıb dərdü-bəla,
Müslümə beyət ediblər firqeyi şumi dəğa,
Bilmirəm indi ağam, harda qalıb ol müqtəda,
Övrətin dildən çıxan vəqtə yanıqlı sözləri,
Qəlbidən bir ah çəkdi doldu Müslüm gözləri.

Dil tutar-tutmaz cavabın verdi ol alicənab,
Sözlərin aramişlə övrətə qıldı xitab,
Lütf edibsən,sən qonağın nabələd etmə hesab,
Kufə şəhrində ana qəmlər çəkən Müslüm mənəm,
Olma narahat anacan, sən deyən Müslüm
mənəm.

Baxdı övrət ahilə şürü-nəvadan ağladı,
Kufə əhli etdiyi zülmü-cəfadan ağladı,
Müslümə baxdı vəli bu macəradan ağladı,
Gəl evə, bəh-bəh, gəlibsən ey əcəb mehman
mənə,
Ağlama,bəsdir,kənizi-Fatimə qurban sənə.

Yaz Muhəmməd, ağan Müslüm sənə olsun
pənah,
Şe`rinin hər nöqtəsində olsa zərrə iştibah,

Naibi-sultani-din-eylər özü hətmən nigah,
Zadeyi-Zəhra Hüseynə naibi-yavərdi bu,
Radi-mərdani-həqiqət, aləmə sərvərdi bu.

## *Müslümün diliycə*

Yox Kufə əhlində vəfa, əmoğlu,
Qəlbdə var zülmi-cəfa, əmoğlu.

Düşmə Mədinədən Hüseyn uzağa,
Yanma mənim tək möhnəti-fərağa,
Bu Kufə hörmət eyləməz qonağa,
Yox zərrəcə zövqi-səfa,əmoğlu.

Millət məni bu şəhrə də`vət etdi,
Gəldim bura əzəldə beyət etdi,
Sındırdı beyəti, xəyanət etdi,
Zülmü mənə gördü rəva, əmoğlu.

Qovzandı nalə göylərə dilimdən,
Düşdüm uzaq qəbiləmdən, elimdən,
Bir şəxs olmadı tutsun əlimdən,
Düşmən mənə vurdu yara,əmoğlu.

Gülşəndə güllərim soldu-saraldı,
Leşkər məni məkri-yelə damə saldı,
Şəmşirim birdən əlimdən aldı,
Üz verdi hər dərdi-bəla,əmoğlu.

Durmadan hamı birbəbir əkildi,
Daği-sitəm bu sinəmə çəkildi,

Damlardan otlar başıma töküldü,
Qəlbim yara, dişlər yara, əmoğlu.

Rəhm etmədi bir kəs bu dağidarə,
Ovçu çox oldu mən düşdüm şikarə,
Axır mənə məskən oldu qənarə,
Oldum  mən də sizdən cüda, əmoğlu.

Bu yer və cəmaət sındırdı vüqarım,
Oldu əcəb şəhadət iftixarım,
Heyf olmadı Əbbasi-namidarım,
Leşkər şekən şiri heyca, əmoğlu.

Zəhra balası, ey gözəl imamım,
Əvvəl uzaqdan var sənə salamım,
Yetsə sənə bu axırın pəyamım,
Gəlmə bu Kufə içrə, ya əmoğlu.

Məhəmmədi qapımda nökər olmuş,
Mənim adım dilində əzbər olmuş,
Bu şe`rlər də zibi-dəftər olmuş,
Olsa deyrdi eylə dəva, əmoğlu.

## *Bayatılar Müslüm haqda*

Mən Müslüməm bəlalıyam, İlahi
Bəlalı macəralıyam, İlahi,
Səsimə yoxdu səs verən qəribəm,
Öz elimdən aralıyam, İlahi.

Bir qəribəm min dərdilə aram var,

Qürbət qəmilə sinədə yaram var,
Evim yox, xanımanım yox, qəribəm,
Hara üz döndərim gedim, haram var.

Ağlayaram elim düşər yadıma,
Yoxdur deyən aşnama, yadıma,
Öldürdülər qərib yerdə Müslümü,
Gəlsin yetişsin Əkbərim dadıma.

Dözüb nəqədər mən dayanım,Allah,
Bu qan yağan şəhri dolanım,Allah,
Hara gedim, hara pənah aparım,
Hansı çırağa daldalanım, Allah.

Nəva və şur doldurub iraqı,
Bəla tutub bu xəsteyi-fəraqı,
Qonağa rəsmidir edəllər hörmət,
Bu Kufə əhli öldürür qonağı.

Tar olubdu dünya mənim gözümə,
Dərdim çoxdur ağlaram öz-özümə,
Əmoğlu can, sənin gözündən iraq,
Vurubdular, qan dolubdu gözümə.

Müslümün oğlanlarının sual-cavabı
Bir il düşdük əgər zindanə, qardaş,
Yetib zindanımız payanə qardaş,

## *İbrahim*

Qolun sal boynuma, biçarə qardaş,
Yataq bir qol-boyun, avarə qardaş.

Məhəmməd

Bir il zindanda gördük çox məşəqqət,
Nə bəstər görmüşük, nə istirahət,
Yataq bir qol-boyun asudə rahət,
Səpək su atəşi-hicranə,qardaş.

İbrahim

Cəzada rusefid olsun bu övrət,
Gətirdi küçədən etdi məhəbbət,
Bir ildi gördük azarü-əziyyət,
Dayandıq zülmi istikbarə, qardaş.

Məhəmməd

Anam yol gözlyəir indi vətəndə,
Xədicə bacım ağlar söz düşəndə,
Bu qürbətdən qurtulsaq sən də, mən də,
Təşəkkür eylərik Yəzdanə qardaş.

İbrahim

Nə müddətdi giriftari-fəraqıq,
Vətəndən, tayfadan eldən uzağıq,
Düçari-məhbəsi-əhli İraqıq,
Axar göz yaşımız rüxsarə, qardaş.

Məhəmməd

Yetişsəm madərə qalmazdı dərdim,
Əlindən və ayağından öpərdim,
Yoluna gözlərimdən su səpərdim,
Olardım şəninə pərvanə, qardaş.

İbrahim
Qəm etmə, arzuna tez çatarsan,
Atasızlıq qəmin başdan atarsan,
Ananla qolboyun bahəm yatarsan,
Yetərsən ne`məti-didarə qardaş.
Məhəmməd
Əgər rahətdi qardaş, rəxtixabım,
Nədir bilməm vəli bu piçü-tabım,
Bu evdən qorxuram var iztirabım,
Salır bu xanə vəhşət canə, qardaş.
İbrahim
Başın qoy yat bəradər, yoxdu çarə,
Təvəkkül eyləyək Pərvərdigarə,
Tələsmə az qalır vəsli-nigarə,
Çox etmə vahimə, məhparə qardaş.
Məhəmməd
Yuxum gəlir ürək titrir, bəradər,
Vücudum qərqi-vəhşətdir sərasər,
Ürək quş tək çalır sinəmdə şəhpər,
Verir qəm səbrimi talana, qardaş.
İbrahim
Gözün qurbanıyam, ey zarü-xəstə,
Başın qoy sinəmə, yat sinəm üstə,
Kəbab etmə məni,ey dilşikəstə,
Məni yandırma bu goftarə, qardaş.
Məhəmməd
Bu bəstər, bu pəzirayi, bu xidmət,
Ola çox qorxuram axır ədavət,
Bu əhli-Kufədə yoxdur məhəbbət,
Bunlar rəhm eyləməz mehmanə, qardaş.
İbrahim
Bir ildi dözmüşük cövri-cəfaya,

Kimə etdik şikayət, ya gilaya,
Bəni-Haşim dözər hər ibtilaya,
Təvəkkül Xaliqi-Qəhhara, qardaş.

Məhəmməd

Kərimi xadimi-Ali-əbadır,
Qoca nökər əli boş üz qaradır,
Düşüb bu dərgəhə getməz gədadır,
Ümid ilə gəlib ehsanə, qardaş.

## *Abdullahın zəban halı*

İstirəm əmmə qoyam rəzmə qədəm tutma məni,
Eşqə bax, sinnimə baxma, belə kəm tutma məni.

Əmimin gəldi səsi bir həyəcan gətdi mənə,
Fürsətim yox eləyim halımı tə`rif sənə,
Aridir qeyrəti-ovladi-İmam Həsənə,
Belə ki, Şümri qoyub ərşə qədəm, tutma məni.

Mane olma mənə sən, əmmə, uzaqdır səfərim,
Sındırıb qəlbimi Qasim kəsilib balü-pərim,
O çatıb məqsədə mən qalmışam, ey tacü-sərim,
O gedən şəhrə gərək mən də gedim, tutma məni.

Bundan artıq nə rəva başı aşağı dolanım,
Əmimin külfəti hər süfrə salanda utanım,
Əmi də getdi dəxi kimdi əlimdən tutanım,
Sayəsiz qaldı səri-əhli-hərəm, tutma məni.

Bir uşaq ki, atanın görməyə dünyada üzün,
Özgələr vəsf edə söz düşsə qaşın ya ki, gözün,

Can verir ta görə bir gün atanın şəxsən özün,
İstirəm can çıxa cananı görəm, tutma məni.

Bax bu həsrətli baxan gözdən axan göz yaşıma,
Başımın fikrini etmə, məni qoy öz başıma,
Görsədim qüdrəti eşqi atama, qardaşıma,
Öz əmimdən eləyim dəfi-sitəm, tutma məni.

Əl-qərəz quş kimi əldən qurtulub şəhpər açıb,
O belin bağladı mərgə anası mə`cər açıb,
Gördü bülbül o gözəl sinə əcəb güllər açıb,
Şümrə amma dedi çox kinəliyəm, tutma məni.

Ya göz aç, bir başın üstündə ki, həqq davərə bax,
Ya utan bu ayağın altda güli pər-pərə bax,
Bu səgahi ləbi-can pərvəri-Peyğəmbərə bax,
Ya su ver ya çəkil, ey kani-sitəm, tutma məni.

Gördün öz meylinə bu çərx eləyən gərdişi sən,
Kimə xatir edisən bir belə nəngin işi sən,
Evi viran, onu boşla məni öldür kişisən,
Yolumu gözlər atam şahi-üməm, tutma məni.

Özünü istədi atsın əminin sinəsinə,
Nagəhan düşdü gözü xəncərin ayinəsinə,
Bir qolun etdi sipər düşməni-por kinəsinə,
Şümr səsləndi qənimətdi bu dəm, tutma məni.

Mən gərək Fatimənin qəlbini naşad eləyəm,
Toyların matəm edib fitnələr icad eləyəm,
Bu yarım gündə Bəni Haşimi bərbad eləyəm,
Moizə eyləmə ey əqli-həkəm, tutma məni.

Baxmadı əql eləyən moizəyə Şümri dəni,
Endirib tiği kəsib şaxeyi sərvi-Həsəni,
Dedi oxşatdın əcəb öz əmim Əbbasə məni,
Vur bu bircə qolu da eylə qələm, tutma məni.

Basdı qolsuz balanı bağrına Zəhra balası,
Ərz qıldı əmi qol düşdü sızıldar yarası,
Ax o Əbbas əmimin sinəmə gəlsin qadası,
Indi bildim nə edib ol kani-kərəm tutma məni.

Məni qaytar anama xeymədə görsün yaramı,
Öldürür kufəli meydanda adamsız adamı,
Həmnişin eylərəm Əbbas anasıyla anamı,
İki qəmdən olacaq qaməti xəm,tutma məni.

Balaya sinədə istərdi ola hafiz əmi,
Ruhi bir şəhqə çalıb səslədi ya hafiz əmi,
Gördü qeyb aləmin ərz etdi Xudahafiz əmi,
Boşla, gəldi atam istəkli nənəm tutma məni.

## *İmamın Zeynəblə (ə) zəban halı*

Al pərçəmi-risaləti himmətlə çiyninə,
Qüdrətlə saxla ləşgər həqqə ləva bacı.
Kaxi-Yezidi məntiq ilə ziru-ru eylə,
Etmə sipahi-düşmənə heç e`tina,bacı.
Yığ pərşikəstə qızlarımı ziri-sayənə,
Sənsən ümüdü-məlcəi-ali-əba, bacı.
Vəqtim keçir, yubansam edəllər səda məni,
Xəncər əlində gözləyir əhli-cəfa, bacı.

Ətrafımı alıb balalar qoymayır gedəm,
Al qızların əlindən özün sal yola, bacı.
Kəsmiş qabağımı bu ğəzəlani-xun cigər,
Həsrətlə tək-təki edir ahu-nəva, bacı.
Gəl Zeynəbim, amandı çətin oldu məsələ,
Göz yaşları bu qəlbimi eləyir yarə, bacı.
Heç bilmirəm Səkinəmi aram edim necə,
Qəmlər əlində təngə gəlib bu bala, bacı.
Məndən sora bəlalı başın çox bəla çəkər,
Axır sizi əsir edəcək əşqiya, bacı.
Söz yox ki,tək-təkiz olacaqsız əsiri-qəm,
Aləm sizə yəqin olar möhnətsəra, bacı.
Salma nəzərdən ahu baxışlı Səkinəmi,
Olmaz cahanda möhnəti qəmdən rəha, bacı.
Atlar qabağına salacaqlar o bikəsi,
Az sinnidə çəkər qəmi biintəha, bacı.
Gün görməyən camalına sili vurar ədu,
Həmdəm olar bəlalara getsə hara, bacı.
Şamın yolunda naqənin üstdən düşər yerə,
Səslər səni haraya o biəqraba, bacı.

## *İmam Hüseyn (ə) vidalaşması*

Zeynəbim, mən kimi İslamə fədakar olasan,
Xar edib zalımı məzlumə tərəfdar olasan.

Xeymələrdə şühədadan axır nəfərəm,
Karivanım yola düşdü olara həmsəfərəm,
Zülməti-zülmü fəna etməyə sübhi-zəfərəm,
Sən də bu yolda gərək qardaşına yar olasan.

Sinəni çak eləyib tökmə belə göz yaşını,
Üzünə lətmə vurub yolma əzizim, başını,
İstəsən razı özündən edəsən qardaşını,
Səbridə sən gərək Əyyubə də me`yar olasan.

Sənə mən tapşırıram Zeynəbim, əhli-hərəmi,
Bağla himmət kəmərin, aç vəli zənciri qəmi,
Can sənin can bacı dinin qana batmış ələmi,
Himmətilə ələmi-dinə nigəhdar olasan.

Gecələr baş çəkəsən Fatimə ahularına,
Qoyma torpaq ola yoldaş qara gisularına,
Mane ol qoysalar baş hər gecə zanularına,
Qövli ver qızlarıma yaxşı pərəstar olasan.

Xeymələr qarət olan ləhzədə tufan olacaq,
Xeyməmin barigahı yeksərə talan olacaq,
Qızlarım çöllərə ahu kimi veylan olacaq,
Elə bir vəqtidə sə`y elə ki, huşyar olasan.

Gecə Zəhra bu çölü dildə Hüseyn vay dolanar,
Məqtəlin başına on bir gecəlik ay dolanar,
Nəhri-Əlqəmdə deyər Əsğəri-lay-lay dolanar,
Könlüm istər bacı, sən də mənə zəvvar olasan.

Sə`y elə kəs sitəmin şişəsin almas kimi,
Gülşənin hərz ələfin eylə diru das kimi,
Bu gecə yatma oyaq qal bacı, Əbbas kimi,
Yarı yatmış çadırın dövrünə pərgar olasan.

Şama üryan dəvədə getməlisən qəlbi kabab,
Karivanında hamı nalə konan didə kabab,
Əsğəri yad eləyib oxşasa biçarə Rübab,
Mənə xatir bacı Zeynəb, ona qəmxar olasan.

Qismət oldu-sənə Ğəffari, Hüseynin qapısı,
Çəkər oddan çox əzadari Hüseynin qapısı,
Cənnətə fəxr eyləyər bəli, Hüseynin qapısı,
Səndə sə`y eylə ki, iffətli əzadar olasan.

## *Həzrət Səkinənin  zəban halı*

Dayan gəldim Zülcənah üstə,
Düş yerə baba,getmə meydana,
Məni tək qoyma bu səhrada,
Dur səni Zəhra, getmə meydana,
Qədəm saxla, var sözüm baba,
Sənə qurbandı bu gözüm,baba.

Nolar bir gün Allaha xatir,
Rəsmi-mərdani yoxlasın düşmən.
Səni məkr ilə budur qorxum,
Ərsədə axır doğrasın düşmən.
Apar qoy bu zari Əsğər tək,
Əllərin üstə oxlasın düşmən.
Və ya qoyma bu del əfkarı,
Bikəsü-tənha getmə meydanə.
Qədəm saxla, var sözüm baba,
Sənə qurbandı bu gözüm baba.

Sənə qurban səbr eylə, bir bax,
Gör necə qəmdən gəlmişəm cana.
Ayaq yalın baş açıq çıxdım,
Xeymədən gəldim mən yana-yana.
Dolanım qoy başina bir də,
Ey qərib baba misli-pərvana.
Fəraqında etmişəm yeksər,
Daməni-dərya, getmə meydana.
Qədəm saxla, var sözüm baba,
Sənə qurbandı bu gözüm, baba.

Məni eşqin etdi divanə,
Öz başıma mən gəlmədim, baba.
Fəraqında qüssəvü-qəmdən,
Qarabəxtəm, dincəlmədim, baba.
Özüm də bu isə heyranam,
Bəs necə gəldim ölmədim,baba.
Qəm hicrin etdi bu zarə,
Məhşəri bərpa, getmə meydana.
Qədəm saxla, var sözüm baba,
Sənə qurbandı bu gözüm, baba.

İki dünyaya baba, şahsan,
Bəs qalıb harda yarü-ənsarın.
Mənə çox nisgildi bu dərdin,
Qalmısan tənha, yoxdu qəmxarın.
Köməksizsən bəs nədən gəlməz,
Qasim və Əkbər, ya Ələmdarın.
Düşüb qolsuz nəhri-Əlqəmdə,
Təşnələb səqqa, getmə meydana.
Qədəm saxla,var sözüm baba,

Sənə qurbandı bu gözüm,baba.

Gecə-gündüz şam tək yannam,
Ey gülü-Zəhra mən fərağında.
Mərizəm mən eşqinə, baba,
Dərdimə dərman var dodağında
Olam rahat mən qucağında,
Ey güli-taha, getmə meydanə.
Qədəm saxla, var sözüm baba,
Sənə qurbandı bu gözüm, baba.

## *İmam Hüseynin (ə) vidası*

Ağa tutdu üz mehriban Zeynəbə,
Nə tək mehriban, qəhrəman Zeynəbə,
Olan sərvü-qəddi kaman Zeynəbə,
Pəri zülm əlilə sınan Zeynəbə,
Dedi qafi eşqə hümadır Hüseyn.

Bacı, istəyirəm əzmi-meydan edəm,
Bu ə`dayə təbliği- Qur`an edəm,
Gərək haqqı dünyaya ünvan edəm,
Xoşam canımı dinə qurban edəm,
Bəla gəlsə söz yox rzadır Hüseyn.

Bacı, sən mənim yarü-dildarım ol,
Bu çöldə ənisi-dil zarım ol,
Ölüb yavərim, indi qəmxarım ol,
Batıb qana, Əbbasü-ələmdarım ol,
Görürsən ki, xunin ridadır Hüseyn.

Ölən vaxtı Zəhrayi-qərq-mühən,
Əmanət sənə verdi bir pirəhən,
O çöldə olmayan vəqtdə mən,
O pirahəni ver Hüseynə kəfən.
Onun sirrinə aşinadır Hüseyn.

Gətir indi o köhnə pirahəni,
Keçir vəqti-meydan, yubatma məni,
Vəkil eylirəm qızlarıma səni,
Vurub başa şad etməyin düşməni,
Fəna dəhrə bi e`tinadır Hüseyn.

Bacı, qoyma qızlar əza saxlaya,
Bu düşmənlər içrə ürək dağlaya,
Fəqət bağlasa haqqa bel bağlaya,
Səkinə gecə sübhəcək ağlaya,
Şirin dilli xoş ədadır Hüseyn.

## *İmamın vidası*

Vaxt o vaxt oldu vidai-axırın etsin imam,
Pa rikab üstə qoyubdu eylədi tərki-xiyam,
Zülcənah-xoş qədəm yol bağlayıbdı qam-qam,
Zindəgidən sirr edibdi dərdi-hicran Zeynəbi.

Zeynəb az qaldı gedə əldən bilib məzlum imam,
Qəlbinin üstə əlin qoydu o şahi təşnə kam,
Ərz edib rəbbül-ibadə ey Xudayi-sübhü-şam,
Qüssədən azad elə bu qəlbi lərzan Zeynəbi.

Məzhəri-Siddiqə-kübrayə Allah, səbir ver,
Rəhm eylə pərvərdə Zəhrayə Allah, səbir ver,
Qəhrəmani-yovmi-Aşurayə Allah, səbir ver,
Daldalandır sayə lütfündə hər an Zeynəbi.

## *İmamın zəban halı*

Sal yola anan Bətulə qardaşın qonaqdı, Zeynəb,
Səbr elə qəmi-fəraqə, eşq bu sayaqdı Zeynəb[2].

Başının bacı, bəlası yetməyib hələ tamamə,
Sən özün də bir Hüseyn, sən ver bu nehzətə idamə,
Hazır ol ki, qəm qatarın Kufədən çəkəllər Şamə,
Şam yolları bilirsən Kufədən uzaqdı Zeynəb[2].

Bu Səkinəni bilirsən çox sevirdim əvvəlindən,
Ağladıb məni yol üstə doymadım şirin dilindən,
Xəstə bülbülü çəməndə ayrı saldılar elindən,
Bir zaman sənə Səkinə Şamidə yavərdi, Zeynəb.

Adət eyləyib mən ilə hər gecə bu qız yatardı,
Qolların salardı möhkəm boynuma, yuxu tutardı,
Sübh mən üzün öpərdim nazilə gözün açardı,
Öyrəşib mənə üç ildi neyləsin, uşaqdı,Zeynəb.

Öldü qardaşın bu çöldə qəlbimə fəraqı oxdu,
Əl tutan gedib əlimdən başımın bəlası çoxdu,
Əkbərim cavan ölübdür qalmağın da həzzi yoxdur,

Bir se şöbə ox bu çöldə gözlürəm haçandı,
Zeynəb.

Mö`cüzi-imamətilə Zeynəbə təkan veribdi,
Qəlbinə əlin ki, qoydu nimə cana can veribdi,
Zeynəbin açıldı nitqi eşqidən bəyan veribdi,
Olma nagiran Hüseynim, nehzətə dayaqdı
Zeynəb.

## *Qətligahın çuxur yeri*

Cəbrəil əmin gəldi o gün Kərbü-bəlaya,
Gördü yıxılıbdır yaralı qanlı Minaya,
Şəhpərlərini ruhul-əmin açdı həvaya,
Saldı yaralı peykərinin üstünə saya,
Şahi-şühəda gördü günün nuru alındi,
Hiss eylədi ki, üstünə bir sayə salındı.
Qanilə dolan gözlərin açdı, dedi kimsən,
Ərz eylədi qurbanın olum nökərinəm mən,
Dünyada Hüseynim, necə qəmlər yemişəm mən,
Gəhvarədə bir il sənə lay-lay demişəm mən.
Əmr eylədi çək şəhpərini fori kənara,
Eyliyir yaralı aşiqə mə`şuq nəzara.
Sən çəkil durma, aşiq və məşuq arasında,
Aşiq odur ki, laxtalana qan yarasında.
Aşiq odur ki, atəşi-mə`şuquna yansın,
Aşiq odur ki, eşqidə mərdanə dayansın.
Aşiq odur ki, başdan ayağa yaralansın,
Bir sinədə dörd min yara al-qana boyansın.
Bəh-bəh nə gözəl bəzmidir xəlvətgəhi-dildar,
Heç bilmirəm yara nədir, çünki baxır yar.

Bəh-bəh nə gözəl səs verir oxlar havada,
Heç nəğmeyi-Davud olanmaz bu sədada.
Bir zərrə əziyyət eləmir yaralı sinəm,
Heç bilmirəm harda qalıb nazlı Səkinəm.
Çək şahpərini sinədə qan çeşməsi axsın,
Yarım yaralı aşiqin əhvalina baxsın.
Mə`şuq rizasına yıxıldım bu Minayə,
Çək şahpərini, salma mənim üstmə sayə.
Fikr eyləmə bir şəxsdir qana boyanıbdır,
Sayəmdə mənim ərşi-Xuda daldalanıbdır.

## *Zeynəbin (ə) zəban halı (növhə)*

Ey su kənarında ləb teşnə verən can, Hüseyn,
Zeynəbi-nalan susuz ləblərə qurban, Hüseyn[2]!
Hüseyn, Hüseyn, ya Hüseyn[3]!

İsti qum üstə düşüb qana batan peykərin,
Var yeri qan ağlaya xahəri-qəmpərvərin,
Hansı şil olmuş əli kəsdi sənin əllərin,
Etdi bu çöldə səni qanına qəltan, Hüseyn[2]!
Hüseyn, Hüseyn, ya Hüseyn[3]!

Cuş eləyir Zeynəbin cismidə xuni-rəgi,
Oldu yəqin dərbədər Şama tərəf getməyi,
Soydular əynindəki Zəhra toxuyan köynəyi,
Rəhm eləməz Zeynəbə ləşkəri-üdvan, Hüseyn[2]!
Hüseyn, Hüseyn, ya Hüseyn[3]!

Baxmadılar yalqızam, pozdular pərgarımı,

Yıxdılar atdan yerə dilbərü-vəfadarımı,
Doğradılar zülmilə qolsuz ələmdarımı,
Çarəm əlimdən gedib, bağrım olub qan Hüseyn! [2]
Hüseyn, Hüseyn, ya Hüseyn[3]!

Var nə səlamət başın, ta ki, öpəm ləblərin,
Yoxdu bədəndə əlin ya ki, öpəm əllərin,
Qoy əyilim bir öpüm qanı axan həncərin,
Bəlkə təsəlli tapa sinyi-suzan, Hüseyn[2]!
Hüseyn, Hüseyn, ya Hüseyn[3]!

Gözlərim olsun fəda yarüna-yoldaşünə,
Olmaya çatmır əlin oğluna, qardaşına,
Lərzə düşüb canıma qoy dolanım başına,
Gün qabağında qalan peykərü-üryan, Hüseyn![2]
Hüseyn, Hüseyn, ya Hüseyn[3]!

Gördü oğulsuz səni, düşmənin oldu cəri,
Qoydu susuz hülqünə Şümri-dəni xəncəri,
Qarət olar qızların başda qara mə`cəri,
Nazlı Səkinən olar didəsi giryan, Hüseyn[2]!
Hüseyn, Hüseyn,ya Hüseyn[3]!

## *Hüseynin qətli (rövzə)*

Kəsəndə Şümri dün başın Hüseynin,
Anası Fatimə əllər duada.
Deyərdi bar ilahi, şahid ol sən,
Tərəhhüm olmadı bu əşqiyada.
Susuz öldürdülər məzlum Hüseyni,
Yanır qəlbim mənim bu macərada.

Vuralar nizəyə bu qanlı başı,
Oxur Qur`an balam nuki-cidada.
Qərəz, gəldi xanım Zeynəb o saət,
Çalxalardı Hüseyn qanlı Minada.
Dedi qardaş, bacın Zeynəb öləydi,
Səninlə dəfn olaydı Kərbəlada.
Bu səhradə Hüseyn can, bir kəsim yox,
Əli Əkbər yatıb qanlı əbada.
Mən ayrılmazdım, amma çarə yoxdu,
Səkinəm ağlayır xeymə sərada.

## *Zeynəbin zəban halı*

Ey dəhridə biçarələrin çarəsi qardaş,
Vardır nə qədər peykərinin yarəsi, qardaş.

Aç gözlərini etmə məni zarü-pərişan,
Cismindəki çox yarana Zeynəb ola qurban,
Əydi necə gör qamətimi gərdişi-dövran,
Saldı başıma yeddi cavan qarəsi, qardaş,
Getməz ürəyindən bacının yarəsi, qardaş.

Əfv eylə üzün qibləyə döndərmədi Zeynəb,
Gördü yaralı peykərini ölmədi Zeynəb,
Dünyada məgər hansı qəmi görmədi Zeynəb,
Zəhra qızıyam, gör nə günə qoydu zəmanə,
Badi-sitəm əsdi, çəmənim döndü xəzanə.

## *Həzrət Zəhranın (ə) zəban halı*

Ey əziz cani-madər, ey şəhi-xuban Hüseynim,
Bu kəsilmiş əllərinə Fatimə qurban, Hüseynim.
Movla Hüseyn can[4]!

Va müsibət, va səbura, canıma düşdü şərarə,
Bu sənin cismindi başsız nur didə parə-parə,
Bir bədəndə kim görübdü ey Xuda, bir belə yarə,
Ahü vaveyla bu dərdə, qəlbim oldu qan,
Hüseynim.
Movla Hüseyn can[4]!

Ey oğul hansı qəmində ağlayım mən yanə-yanə,
Eyləyim nalə cəfayi Şümrü dunə ya Sinanə,
Ağlayım Xuli əlindən ya cəfayi sarbanə,
Gör necə dildən çəkim ya şivənü əfğan
Hüseynim.
Movla Hüseyn can[4]!

Eylərəm qanilə rəngin mən bu zülfi-tabdarı,
Ruzi-məhşər dərk edəndə məhzəri-pərvərdigarı,
Eylərəm şikvə Xudaya bu cəfayi-bi şümarı,
Hökm edər ədlilə onda Xaliqi-sübhan, Hüseynim.
Movla Hüseyn can[4]!

Bu Peyəmbərdir, bu Heydər, bu Həsən,bu mən
ciyərxun,
Bu sənin cismi-şərifin belə al-qanilə gülgün,

Dur danış öz sərgüzəştin ey oğul, ba hali-məhzun,
Söylə hər zülmü-cəfa kim eyləyib üdvan, Hüseynim.

Movla Hüseyn can[4]!

## ***Zeynəbin (ə) zəban halı***

Balaların axar qanı, Hüseynim vay, Hüseynim vay!
Edər gülnar meydanı, Hüseynim vay, Hüseynim vay!
Bacın qurban başın hanı? Hüseynim vay, Hüseynim vay!
Gülüstanda açıb güllər, Hüseynim vay,Hüseynim vay!
Gəlib avazə bülbüllər, Hüseynim vay, Hüseynim vay!
Edər növhə yanan dillər, Hüseynim vay, Hüseynim vay!
Sinən üstə yarun çoxdur, Hüseynim vay, Hüseynim vay!
Tamami nizə və oxdur, Hüseynim vay, Hüseynim vay!
Öpəm busə yeri yoxdur, Hüseynim vay, Hüseynim vay!
Susuz əldə ölən qardaş, Hüseynim vay, Hüseynim vay
Yaralı can verən qardaş, Hüseynim vay, Hüseynim vay

Hanı ol pirəhən qardaş? Hüseynim vay,
Hüseynim vay
Gərək qan ağlasın Zeynəb, Hüseynim vay,
Hüseynim vay
Cahani dağlasın Zeynəb, Hüseynim vay,
Hüseynim vay!
Sənə yas saxlasıın Zeynəb, Hüseynim vay,
Hüseynim vay!
Bacın ölsün bu nə haldı, Hüseynim vay,
Hüseynim vay!
Arada peykərin qaldı, Hüseynim vay,
Hüseynim vay!
Məni çöldən çölə saldı, Hüseynim vay,
Hüseynim vay!
Qalıbdır peykərin yerdə, Hüseynim vay,
Hüseynim vay!
Çəkib qan yarüvə pərdə, Hüseynim vay,
Hüseynim vay!
Libasın qalmış əllərdə, Hüseynim vay,
Hüseynim vay!

## *Zeynəbin zəban halı*

Ey qızların gözdən atan Hüseynim,
Tənuri-Xulidə yatan Hüseynim.
Qudalidə başsız qalıb cənazən,
Ey cisminə oxlar batan Hüseynim.
Harda qaldı uşaqlar Hüseynim,
Ağlar sənə qonaqların Hüseynim.
Necə öpüm yaralı ləblərindən,
Yaralıdır dodaqların Hüseynim.

## *Səkinənin zəban halı (Nöhə)*

Baba gəlmişəm sənə ağlayam,
Öz əlimlə yarəni bağlayam,
Bu Minada yasını saxlayam,
Mənilə danış, gözü yaşlıyam.

Ciyərim yanıb baba, gəlmişəm,
Başıma qara baba , salmışam,
Səni bu məkanidə tapmışam,
Mənilə danış, gözü yaşlıyam.

Baba quşvarəmi aldılar,
Məni at qabağına saldılar,
Həm soydular, həm vurdular,
Mənilə danış, gözü yaşlıyam.

Sinən üstə al Səkinəni,
Eylə sərəfraz bu yetiməni,
Niyə atmısan bu əzizəni,
Mənilə danış, gözü yaşlıyam.

Qızım, halüə özüm ağlaram,
Bu yaralı qəlbimi dağlaram,
Səni gəl bu sinədə saxlaram,
Ayağın yarasını bağlaram.

Hamı əmmələr soyulub, baba,
Bacılar bu gün yorulub, baba,
Mənə qamçılər vurulub, baba,

Mənilə danış, gözü yaşlıyam.

## *Zeynəbin (ə) zəban halı*

Əllərdə Hüseyn,pər-pər olan gül sənə bənzər,
Hansı bacının qardaşı ölsə, mənə bənzər.
Hüseyn can, sənə qurban[2]!

Düşmənlər içində ucadan ağlamaq olmaz,
Fəryada gəlib qəmli ürək dağlamaq olmaz,
Qardaş, bu qədər yarənı heç bağlamaq olmaz,
Oxlar gül açıbdır, bədənin gülşənə bənzər,
Hansı bacının qardaşı ölsə, mənə bənzər.

Gülzarima bu çöldə müxalif yeli əsdi,
Axır dözə bilməm, bu qədər qəm mənə bəsdi,
Qardaş, de görüm əllərini kim necə kəsdi?
Heç kafiri-mütləq belə bir düşmənə bənzər?
Hansı bacının qardaşı ölsə, mənə bənzər.

## *Həzrət Zəhranın (ə) zəban halı (rövzə)*

Aç gözünü gözəl bala, qanlı gözünlə bax mənə,
Qəlbi sınan anan gəlib qətlgahında şivənə,
Əl-ətəş, əl-ətəş dedin sən yıxılanda düşmənə,
Çeşmə səlsəbildən su gətirib baban sənə,
Rəf rəfe-naz edən açıb başını pa piyadadır.

Fatiməyəm, bəlakeşəm, yoxdu Hüseyn,
fərağətim,
Ömrüm az oldu dəhridə olmadı istirahətim,

İrs yetibdi Zeynəbə qüssələrim, müsibətim,
Dərgəhim odlanan günü oldu mənim qiyamətim,
Zeynəbimin qiyaməti ərseyi-Kərbəladadır.

## *Zeynəbin zəban halı (nöhə)*

Sirişgim oldu nisyan tək bu səhradə rəvan,
qardaş,
Oyan, köç eyləyir Zeynəb bu çöldən nagiran,
qardaş,
Quru yerdə yatan qardaş – oyan qardaş, oyan
qardaş!

Oyan əhvalıma bir bax əlimdə ixtiyar olsun,
Görəm sənsiz cahanı bu məkanda tirə tar olsun,
Rəva bilmə bacın bu ayrılıqdan əşgbar olsun,
Oyan yorğun qatarı sal yola, ey mehriban qardaş,
Quru yerdə yatan qardaş – oyan qardaş, oyan
qardaş!

Əlimdə çarə yox qardaş qəmilə əşgbar oldum,
Bu çöldə səbrilə mən naqəyə axır süvar oldum,
Gəlyədin sən özün dildə nə qədri intizar oldum,
Gözüm yolda qalıb giryan, ürəkdə yox təvan,
qardaş,
Quru yerdə yatan qardaş – oyan qardaş, oyan
qardaş!

Ayırdı bülbülü güldən sitəmlə firqeyi-kafir,
Düçari-nari-hicranda gülüstanda solan güllər.
Oyan bir Zeynəbi dindir səni cani Əli Əsğər,

Fəda ol cismə ki, xarə cəfa eyliyib nəhan qardaş,
Quru yerdə yatan qardaş – oyan qardaş, oyan qardaş!

## *Qətligah (rövzə)*

Saət o saət oldu, məqsudə çatdı ləşgər,
Fülkün-nicati-ümmət qudalə saldı ləşkər,
Güşvari-ərş aldı ağuşə tirü-xəncər,
Ya ləytəna turabən səsləndi ərşi-davər,
Üz qoydu əhli-məna yeksər Minayə ğəlsin.

Göndərdi Zülcənahı xərgahi-tahiratə,
Miqati-eşqi gördü şayəstə əs-səlatə,
Qan aldı dəstəmazın, naz eylədi Fəratə,
Razü-niyazın etdi Xəllaqi-kainatə,
Haqq aşiqi çox istər həmdü-sənayə gəlsin.

Qan laxtası gözündə, qəlbində ox yarası,
Doldurdu qətlgahı ya Rəbbəna sədası,
Həml etdi müşkülatı ümmət gerəh-guşası,
Ya Rəbb o sən bu əbdün və əhdimin vəfası,
Xoşdur bərat Cənnəti əhli-vilayə gəlsin.

## *Saribanın qətlgahda cəfası (nöhə)*

Ey badi-müxalif bu gözəl gülşənə əsmə,
Başım kəsilib rəhm elə zalım, əli kəsmə.
Ey Allah, ey Allah!
Ey kafiri-mütləq, nə cəfa bəzmi qurursan,
Axır niyə bir belə inad üstə durursan,

Gör hansı ələ xəncəri-bürrani vurursan,
Qəlbində bu qəlbim kimi ey kaş dağ olaydı,
Əlsiz yıxılan qardaşım əlan sağ olaydı.

Ey mərdi-dəni qəm günü ğəmxarım, nolubdu,
Bu çöldə necə yarü-həvadarım ölübdü,
Nəhr üstə ucaboylu ələmdarım ölübdü,
Əbbas ələmin indi alıbdır ələ Zeynəb,
Qorxum budu əlan başım üstə gələ Zeynəb.

Fikr etmə ölüb indi ki, sərdarı Hüseynin,
Bu çöldə demə yoxdu həvadari Hüseynin,
Zeynəb kimi var yaxşı ələmdarı Hüseynin,
Kəsmə əlimi qoy qala sərbəstə bu mətləb,
Başsız görüb, əlsiz necə görsün məni Zeynəb.

## *Zeynəbin zəban halı*

Dönübdür qamətim qəmdən kəmana,
Dəyibdir başıma çox taziyana,
Təvəccüh eylə sən bu bağrıqana,
Çıxar ərşə mənim bu dudi-ahım.

Yoxumdur bir nəfər fəryada gəlsin,
Adamsız mövqeyimdə dada gəlsin,
Yanır xeymən mənim, imdada gəlsin,
Niyə gəlmir mənim ol sərsipahım?

Hüseyn can, Zeynəbin gözdən atıbsan,
Sənə qurban olum, qana batıbsan,
Yaralı gün qabağında yatıbsan,

Gedib əldən təmamən izzü-cahım.

Gələydi kaş anam Kərbü-bəlaya,
Görəydi Zeynəbi düşmüş bəlaya,
Ölüb qardaşları batmış əzaya,
Edər daşa əsər bu suzi-ahım.

Batıb qardaşlarım meydanda qana,
Salıbdır Zeynəbi gözdən zamana,
Solub güllər gedib gülşən xəzana,
Nə vardır bir kəsim, nə dadi-xahım.

Bu gülşəndə qızıl güllər solubdu,
Əliyyu Əkbər və Qasim ölübdü,
Ürəyim dərdü-möhnətlə dolubdu,
Bu çöldə ey Xuda, sənsən güvahım.

## *Zeynəbin zəban halı (rövzə)*

Alışıb xeymələrin oldu hava tirü-tar,
Kərbəla dəştini yeksər bürüdü gərdü-ğübar,
O çətin mərhələdə göz-gözü görməzdi nə var,
O həyahuda edən himməti-mərdanə mənəm.

Nə baxır pozulan halıma, nə göz yaşıma,
Yox görürlər köməyim, çatmır əlim qardaşıma,
Səslirəm dada səni qamçı vurullar başıma,
Yeddi qardaşı ölən qəlbi dönən qana mənəm.

Qorxuşur itrəti-taha gedib əldən köməyi,
Xırdaca qızlarımın qana dönübdür ürəyi,

Od tutub yandı şirin dilli Səkinə ətəyi,
Dedi gəl əmmə, yanan atəşi-suzanə mənəm.

Birinin çoxdu ürəkdə qəmü-dərdü-kədəri,
Birinin axdı o böhranda üzə əşki-təri,
Birinin vurdular quş tək yıxılıb sındı pəri,
Səslədi gəl baba, bu xanəvü-kaşanə mənəm,

Biri tez-tez soruşur əmmə, babam hardadı bəs,
Sitəmilə bizə axır bu cahan oldu qəfəs,
Səslirəm hey əmim Əbbası mənə vermir səs,
Şiddəti qüssədən ey əmmə, gələn canə mənəm,

Düşdü dildən o del əfsurdə yorğun balalar,
Çoxu az qaldı yanan xeymələr içrə yanalar,
Necə izhar eyləyim qaldı nə hala analar,
Qəm şəriki olan ol şəmi-pərişanə mənəm,

Əl-qərəz xeymələrin qarət işi oldu təmam ,
Soydular hər nə vardı aparıb qövm-zəlam,
Ürək istərdi gətirsin eylə bir yerdə dəvam,
Dözən ənduhü-müsibati-fərəvanə mənəm.

Biri gəhvarə gətirdi, birisi zər aparıb,
Biri yandırdı yanan qəlbimi zivər aparıb,
Biri güşvarə çıxardıb, biri mə`cər aparıb,
Ələyən gözdən ürək qanını damanə mənəm.

## *Qarəti-xiyam (cuşi)*

Dadə gəl odlandı xiyam, Hüseynim, Hüseynim,
Düşdü çölə əhli-hərəm, Hüseynim, Hüseynim!

Oldu ürək tiri-qəmə nişanə, nişanə,
Saldı bizi gözdən əcəb zəmanə, zəmanə,
Qızlar olub dəşti-qəmə rəvanə, rəvanə,
Kama çatıb qövmi züləm, Hüseynim, Hüseynim!

Əhli-hərəm oldu bəla düçari, düçari,
Şölə çəkib artdı ürək şərari, şərari,
Ovçu necə damə salar şikari, şikari,
Damə düşüb əhli-hərəm, Hüseynim, Hüseynim!

Dildə mənim dərdi-dilim nihandı, nihandı,
Xeymə yanıb izzətimiz talandı, talandı,
Ey şəhi-din çarə elə amandı, amandı,
Zülm eliyir əhli-sitəm, Hüseynim, Hüseynim!

Qızlarının parçalanıb dodağı, dodağı,
Sili dəyib nili olub yanağı, yanağı,
Çoxlarının yarəlidir qulağı, qulağı,
Yandırar afaqı bu qəm, Hüseynim, Hüseynim!

Taqətü-aramımızı alıblar, alıblar,
Qəlbimizə tiri-qəmi çalıblar, çalıblar,
At döşünə qızlarını salıblar, salıblar,
Şövkətimiz oldu behəm, Hüseynim, Hüseynim!

Ey şəcəri por səməri-risalət, risalət,
Fəxridi alillahə bu şəhadət, şəhadət,
Ölməmisən eylə kərəm, Hüseynim, Hüseynim!

Ali-Əlinin pozulub nizamı, nizamı,
Almış ələ indi ədu zamanı, zamanı,
Yandırır odlarda qoşun Imamı, Imamı,
Çarə qıl ey miri ümən, Hüseynim, Hüseynim!

Taqətimi əldən alıb Səkinə, Səkinə,
Gül kimi qəmdən saralıb Səkinə, Səkinə,
Bilmirəm heç harda qalıb Səkinə, Səkinə,
Ol gülü Siddiqəsiyəm, Hüseynim, Hüseynim!

Dama düşübdür o gözəl qənari, qənari,
Döndü xəzan oldu onun bəhari, bəhari,
Düşsə gülüstanə əgər güzari, güzari,
Sərvin edər qəddini xəm, Hüseynim, Hüseynim!

Yoxdu dünyanın Hüseyn səfası, səfası,
Çoxdu qəmi yoxdu vəli vəfası, vəfası,
Nökərinin ərşə çıxıb nəvası, nəvası,
Etdikcə nöhə rəqəm Hüseynim, Hüseynim!

## *Şami-Qəriban (nöhə)*

## *Zeynəbin zəban halı*

Dərdin gətirib Zeynəbi-zari dilə, qardaş,
Harda bələşib üz gözün axır külə, qardaş.

Keçmiş gecəni harda səhər etdin,
Hicrində yetim qızları xunciyər etdin,

Bikəs bacını sübhə kimi didətər etdin,
Hər ləhzə fərağın dolanıb bir elə, qardaş.

Ey gül, gətiribsən məni bülbül kimi şura,
Mehmanidin aya de görüm hansı şərura,
Olma aparıb Xuli səni qoydu tənura,
Getdin niyə mehman elə bir ərzələ, qardaş.

Düşmən gözümün yaşını al-qanə qatıbdı,
Hər möhnətü-qəm var bu del əfkarə çatıbdı,
Sər nizə də gördüm ki, başın qanə batıbdı,
Vurdum başımı şiddətilə məhmilə, qardaş.

## *Həzrət Zəhra (ə) zəban halı*

Başın bədəndən ayrılıb Hüseyn, nəvayə
gəlmişəm,
Gül üstə yatma nazilə oyan, əzayə gəlmişəm.
Yaralı başına fəda – qəmində eylərəm nəva!

Mənəm yaralı Fatimə cahana nalə salmışam,
Susuz kəsiblər başını şərari qəmdə yanmışam,
Qalıb belimdə əllərim bu qüssədən qocalmışam,
Bulud kimi gözümdə yaş, bu qəm sərayə
gəlmişəm.

Yaralı Zeynəbi nədən oğul, gözündən atmısan,
Başında yara Kufəyə gəlib kül üstə yatmısan,
Mənim də eylə fikrimi, oğul, məni qocaltmısan,
Bu nə bəladı çulğuyub səni bəlayə gəlmişəm.

Qəmində var yeri tökəm sirişkimi üzarına,
Cahanda qəm əsasını veriblər ixtiyarıma,
Oyan özün nəzarə qıl bu çeşm-əşkbarıma,
Bulud kimi gözümdə yaş, bu qəm sərayə gəlmişəm,

## *Şəhidlərin dəfni İmam Səccadın (ə) zəban halı*

Hüccəti-Xuda gəldi Kufədən dəfn edə yaralı atasını,
Baxdı nə`şinə doldu gözləri, səslədi Bəqidən anasını.

Əllərin qoyub xəstə qəlbinə şəhri-Yəsribə döndərib üzün,
Dizləri əsib, taqəti gedib xun əşkilə doldurub gözün,
Hiss edibdi zülmü şəqavəti, zə`filə yıxıb torpağa özün,
Əlləri ürəkdə yana-yana səslədi Bəqidən anasını.

Gül bədənlərə baxdı ağladı, ah-naləsini saldı göylərə,
Ney kimi ürəkdə sızıldadı, tapmadı kəfən şahi-məhşərə,
Vay baba deyib cismi titrədi, qüssədən gəlib dizləri yerə,
Torpaq üstə əyləşdi ağlaşdı, saldı bir göyə qəm nəvasını.

Gün evində qanlı bədənləri bikəfən görüb baxdı ağladı,
Tökdü əşkini gül üzarinə teşnələb babasın qucaqladı,
Əkbərə baxıb, Əsğərə baxıb, dildə nalədən sinə dağladı,
Yana-yana çöllərdə nəşr edib aşkara zülmün cəfasını.

Bükdü bir həsirə atasını, qəbrə qoydu qəlbində ahına,
Döndərib üzün şəhri-Yəsribə səslədi haraya yetiş, baba,
Qəbrə bikəfən qoydum oğlunu peykəri sərasər dolu yara,
Gəl Mədinədən Kərbəlaya sən, ox yarasının qoy dəvasını.

Cəm edib tamam ölənlərin, torpağa qoyub höccəti-zaman,
Sel edib sirişkin üzarinə, halına mələklər edib fəğan,
Gün qüruba yetdi hərasilə, qara puş olub mülki-asiman,
Ahilə nəhan eyləyən zaman höccəti-Xuda din fədasını.

Ey qəbilə əhli dedi, gəlin dəfn edək babamın vəzirini,
Qolları qələm torpağa düşən Fatimə anamın əzizini,

Əllərin verən, dini saxlayan, dildə təşnələr əşkrizini,
Xırda qəbridə eləyək nəhan Zeynəb əmməmin bavəfasını.

Axtarın qələm qolların tapın rəsm ilə vuraq başa, ağlayaq,
Qəbri üstünə qanlı pərçəmin nəsb edib bu gün sinə dağlayaq,
Nəşr ola olub dininə fəda, baş tərəfdə din bayrağın vuraq,
İzzətilə torpağa tapşıraq dəşt Kərbəlanın bəhasını.

## *Həzrət Zəhranın (ə) zəban halı*

Güllər üstündə yatan başına qurbanam, Hüseyn!
Gözünü aç, sənə bu şəhridə mehmanam, Hüseyn!
Dur oğul himmət elə-anana xidmət elə!

Başının layiqi mətbəx deyil ey nuri-cinan,
Sinəmə qoy başını olma bu qədri nigaran,
Gəlmişəm şami-qəribanına qəlbim dolu qan,
Bu qəfadan kəsilən başına qurbanam, Hüseyn!

Bu müsibət büküb axır görürsən qamətimi,
Səlb edib dildə cəfa əhli oğul taqətimi,
Dur, özün dərk elə sinəmdə olan möhnətimi,
Gəlmişəm cana bu gün dildə pərişanam, Hüseyn!

## *Həzrət Zeynəbin (ə) zəban halı (rovzə)*

Xudahafiz Hüseyn, ey sərvəri-əbrar, mən getdim,
Cəvari-rəhmətindən ayrılıb naçar, mən getdim.
Bu başsız ləşgərin, bu sən, bu dəşti-Kərbəla, qardaş,
Zəmini-şurə zari eylə sən gülzar, mən getdim.
Ölən ləşqər sənə çatdı, qalan ləşqər mənim oldu,
Tamam oldu daxi bərnamə küştar, mən getdim.
Ələmdarın ölübdü qoymaram mən pərçəmin yatsın,
Sənə ollam özüm hər yerdə pərçəmdar, mən getdim.
Sənə yas tutmağa nə qoydular, nə fürsətim oldu,
Güzərgəhdi bu çöl, yoldan keçən ağlar, mən getdim.
Olub nim-xiz əzan ver, karvanım qoy yola düşsün,
Əgər çe sinənə oxlar edər azar, mən getdim.
Diyari-Kərbəla doqquz gecə oldu bizə mə`va,
Ağardı qüssəsindən zülfü-meşgin bar, mən getdim.

## *Zeynəbin (ə) zəban halı*

Bu çuxur yer ətrafında özün haciyi-eşq,
Zeynəbin yuxulamayan gözləri zəmzəm yaralı.
Aləmü-Adəmə e`zazü-şərəf səndəndi,
Sənilə topraq olub həzrəti-Adəm, yaralı.
Kimdi Sə`d oğlu əsir eyliyə Zeynəb bacını,
Sən əsir eyləmisən qoy belə aləm yaralı.
Atəşin nitq ilə gedirəm fəth eləyəm,
Dildə ləbbeyk Hüseyn sinəsi porqəm, yaralı.

Kufədə onda ki, Qur`an səsini allam, Hüseyn,
Çubi-məhmilə vurram başı möhkəm, yaralı.
Kərbəla qoy sənin olsun yatasan Əkbər ilə,
Gedirəm mən də vuram Şamidə pərçəm, yaralı.
Yığmısan dövrünə nazilə ay-ulduzlarını,
Həmrəhim qara ləçəklərdi münəzzəm, yaralı.
Bu Səkinəndi düşüb sinən üstə yaralı,
Tökülür göz yaşı rüxsarinə nəm-nəm, yaralı.
Gül boğazından Hüseynim, elə yerdən öpərəm,
Nə atam, nə anam öpübdü, nə də xatəm, yaralı,
Xeymələrdən ki, dünən əzm elədin ayrılasan,
Can yığışdı sinəmə mən dedim ölləm, yaralı.
Əl qoyub sinəmə etdin məni yol üstə dua,
Təzə can gəldi mənim canıma kəm-kəm, yaralı.
Kim kəsibdir o şəfabəxş əlini məqtəldə,
Mən dünəndən betərəm bəs hanı mərhəm, yaralı.
Zeynəbin şə`nü-vüqarı sənidin əvvəldən,
Nə yatıbsan quru yerdə, bu nə aləm, yaralı?
Mən görəndə kürəyin üstə yıxılmışdın, Hüseyn,
Necə düşdün üzün üstə şəhi-ə`zəm, yaralı?
Baxıram dildəki ox yarənə göynər ürəyim,
Ürəyim yarənə qurban ola hər dəm, yaralı.
Kaş öləydi bu çuxur yerdə bacın Zeynəb də,
Dəfn edəydi o əşayir bizi bahəm, yaralı.
Baxma çarəm kəsilibdir, gözü yaşlı gedirəm,
Doyammadım səndən Hüseyn, ey qəmi müdğəm
yaralı.

## *Zəban halı Zeynəbin (ə)*

Olan ey dini-Qur`ana susuz yorğun fəda qardaş,
Gedir Şama bacın Zeynəb, özün dur sal yola,
qardaş,
Sənə qurban özüm – qalıb ağlar gözüm.

Bu çöldə qamətim qəmdən anam tək oldu xəm,
qardaş,
Sənin eşqində xəm qəddin bacın eylər ələm,
qardaş,
Ki, rahi-eşqə eşqilə qoyub Zeynəb qədəm, qardaş,
Yaralı həncər ilə dur məni eylə dua, qardaş,
Sənə qurban özüm – qalıb ağlar gözüm.

Qolu bağlı qiyam etdi qiyamət eləyən Zeynəb,
Sənin rahi-qiyamından himayət eləyən Zeynəb,
Bu qanlı peykərin gəldi ziyarət eləyən Zeynəb,
Əgərçe vardı qəlbində qəm biintəha, qardaş,
Sənə qurban özüm – qalıb ağlar gözüm.

## *Zeynəbin zəban halı*

Kərbəla gülşəni çün səhni-məhşərdi, Hüseyn,
Bu gecə gülşən onun gülləri pər-pərdi, Hüseyn.
Olu gülşəndə yaşıl qırmızı nilufərgül,
Vəli burda hamısı lalə əhmərdi, Hüseyn.
Nəxli bir yana düşüb laləsi bir yanda qalıb,
Türbəti gərçi onun pakü-mütəhhərdi, Hüseyn.
Bağbana, nə gəlib qönçə xoş mənzərinə,
De görüm qönçə ətşanını kim dərdi, Hüseyn?
Bacın ölsün yaralı, ver məni biyarə cavab,
Niyə bəs güllərin on səkkizi bisərdi, Hüseyn?

Hər gülün gülşənin aləmara bir bülbülü var,
Bülbülü nazlı Səkinə qara mə`cərdi Hüseyn
Qamçılar altda sınıb bülbülünün balü-pəri,
Əli qoynunda qalıb zarü-mükəddərdi, Hüseyn.
Çox sevirdin hamıdan sən bu qaragöz balanı,
Çox deyərdin nənəmə gözləri bənzərdi, Hüseyn.
Əli əldən üzülüb qüssəlin, pərvanələrin,
Tərk edir gülşəni bi yarü-dilbəri Hüseyn.
Gedirəm Kərbü-balədan qolu bağlı, yaralı,
Dur özün sal yola çun xəstə müsafirdi Hüseyn.
Bu səfərdə mənə yavərdi əxa Zeynül-ibad,
Sənə həmdəm vəli Əbbasi-dilavərdi, Hüseyn.
Mənlə yoldaşdı qəmli Səkinəylə Rübab,
Sənilə həşrə kimi Qasimü-Əkbərdi, Hüseyn.
Mənim həmrazım əxa, nazlı Səkinən olacaq,
Sənin əmma sinən üstə Əli Əsğərdi, Hüseyn.
De Əli əkbərə versin dalımızca bir azan,
Bilsin aləm ki, bunlar ali-Peyğəmbərdi, Hüseyn.
Dur özün xəstə müsafirləri axır yola sal,
Kim sənə ya ki, Əbul-fəzlə bərabərdi Hüseyn?
Ehtiyacım bilirsən var uca boy qardaşıma,
Zeynəbin dərdinə dərman o uzun əllərdi,
Hüseyn.
And ola zülmilə pəhlusu sınan Fatiməyə,
Kərbəla dərdi inan Zeynəbi öldürdü, Hüseyn.

## *Həzrət Zeynəbin (ə) zəban halı (rövzə)*

Əcəl seli gəlib aşsın başımdan,
Xilas olsun gözüm bu göz yaşımdan,
Ölüm çox yaxşıdır, həsrət çətindir,
Yanımda yox bacımdan, qardaşımdan.

Çəmən tək badi-möhnət əsdi soldum,
Bulud tək əşkim axdı, əşkə doldum,
Yatan baxtım ölən vaxtd oyandı,
Qəribliklə gəlib həmsayə oldum.

Yığışdı sinəmə can, qardaşım gəl,
Gələn yollarına qurban, qardaşım gəl,
Yapış Əbbasın əlsiz əlindən,
Dilində zikri-Qur`an qardaşım, gəl.

Nəfəs düşdü şümara qardaşım, gəl,
Düçarə, ehtizara qardaşım gəl,
Qəmim qurtarmadı ömrüm qurtardə,
Məni gəl qoy məzara qardaşım, gəl.

## *Zeynəbin zəban halı*

Gəl yetiş imdada ey qardaş Hüseynim, hardasan?
Bikəsəm səhrada ey qardaş, Hüseynim,
hardasan?

Əhli-Kufə "vay Hüseyn" söylüb batıbdır yasına,
Matəmin qüvvət verib Zeynəb bacın avazına,
Dövrəmi düşmən alan Kərbübəla dəryasına,
Olmuşam bir adə, ey qardaş Hüseynim,
hardasan?

Əl-əman "vay" söyləməkdən ah ilə gözlər dolub,
Zeynəbin, Rübabın, Səkinənin saçların ağlar
yolub,
Yoxluğundan xeymələr od ağlayan meydan olub,

Şümrütək cəlladə, ey qardaş
Hüseynim,hardasan?

Mürrət ibn Münqəz Əbdi baxmayıb Peyğəmbərə,
Nizə sancdı gül Hüseyn oğlu Əliyyi Əkbərə,
Hərmələ peykanını atdıqca körpən Əsğərə,
Qan dolub səhrada ey qardaş Hüseynim,
hardasan?

İbn Sə`d qəh-qəh çəkib taxtında şad-xürrəm olub,
Yezidin çeşmində aləm qalibi-aləm olub,
Taifin əhlin, əyalın bir əsiri-qəm olub,
Ol İbn Ziyadə ey qardaş Hüseynim, hardasan?

Halına Pərvərdigar "qan ağlayın" fərman edər,
Dərdi hicrandan mələklər ağlayıb əfğan edər,
Matəmin məftun könüllər dağlayıb viran edər,
Hər gələndə yada ey qardaş Hüseynim,
hardasan?

İstəyərsə bu cahan mülkündə hər kəs ağlasın,
Söyləyib qeyrət ağam teşnəm Əbəlfəzl ağlasın,
Kərbəla dəştində qoyma tək o bi kəs ağlasın,
Əl yetir Səccada ey qardaş Hüseynim, hardasan?

Solsa da xoşbəxt güzarından sənin haqqın cüda,
Sən bu haqq dünyasının fövqündə gördün tək
Xuda,
Növcəvankən Qasimin pak canını etdi fəda,
Haqq Hüseyn sevdada, ey qardaş Hüseynim,
hardasan?

Bu Xaqani canını qurban dilər tək canına,
Bir nökərdir dininin-imanının fərmanına,
Cismini qərq eyləyib gözdən axan al qanına,
Hey gələr fəryada, ey qardaş Hüseynim,
hardasan?

## *Zeynəbin zəban halı*

Kərbəladan qolu bağlı gedirəm Şama, Hüseyn,
Ölüb Əbbas çatıb düşmənimiz kama, Hüseyn.

Qan tökən düşmənimiz almadı aləm boyu seyr,
Şümr olub qafilə Zeynəbə əs-saə əmir,
Xırdaca qızlar olub ləşkəri-züllamə əsir,
Quş kimi qızlarını saldı ədü dama, Hüseyn.

Kərbəladan yaralı didəsi giryan gedirəm,
Yarü-ənsarım ölüb zarü-pərişan gedirəm,
Anasız qızlar ilə Kufəyə mehman gedirəm,
Dəstgirəm necə gör düşməni-bədnamə, Hüseyn.

Qızların Şama gedir, qardaş Hüseyn, dil nigaran,
Bu müsafirləri düşmən aparır nalə konan,
Dalımızca de Əli Əkbərinə versin azan,
Gözdə rövşən günüzüm heyf dönüb şama
Hüseyn.

Dur özün Zeynəb biyavəri qardaş, yola sal,
Növcavan oğlu ölən madəri qardaş, yola sal,
Yeddi qardaşı ölən xahəri qardaş, yola sal,
Xidmət etdim nə gözəl məktəbi İslama, Hüseyn.

Siz öləndən sora çox düşmən ihanət eylədi,
At çapıb nə`şizin üstündə cinayət eylədi,
Tökülüb xeymələri zülmilə qarət eylədi,
Lə`nəti-həqq gələ aləm boyu züllama, Hüseyn.

Əlim ellərdən üzülmüşdü yanan vaxtda xiyam,
Az qaldı yana zülm atəşinə yalqız imam,
Ürəyim eyləmədi ləhzə o əsnada davam,
Özümü verdim o dəm atəşi bədnama, Hüseyn.

Bu gülüstanda yerə lalə və reyhan tökülüb,
Baxıram hər tərəfə nə`şi şəhidan tökülüb,
Elə bil parələnib məqtələ Qur`an tökülüb,
Ruzi əzəldə yazılmış belə bərnama, Hüseyn.

Görcəyin nə`şi-şəhidanı bu yorğun balalar,
Tab edə bilmədi bir ləhzə oğulsuz balalar,
Çün oğul dağı nənə sinəsinə od qalalar,.
Vay balam, vay deyəcək sübhidən axşama,
Hüseyn.

Dəvə üstdən balalar atdı özün fori yerə,
Ürəyin qanını qatdı hamısı əşki-tərə,
Biri qan ağladı Əbbasə, biri südəmərə,
Məhşərə döndü bəla dəşti o hengama, Hüseyn.

Biri əsrarını o halidə yoldaşa dedi,
Biri nalan oturub dərdini qardaşa dedi,
Biri döndü sözünü nizədəki başa dedi…

## *Zeynəbin (ə) əhvalatı*

Salam et əvvəl məh liqa Zeynəbə,
Süruri-del Mürtəza Zeynəbə,
Sora ağla qan ba vəfa Zeynəbə,
Rəhi-həqqidə canfəda Zeynəbə,
Çatıb dəhridə hər bəla Zeynəbə,
Müsibət keşi-Kərbəla Zeynəbə.

Yazılmış cəlayi-vətən Zeynəbə,
Risalət çatıb şiri zən Zeynəbə,
Əsarətdə var çox mühən Zeynəbə,
Qolunda tənab versən Zeynəbə,
Qurar şiə bəzmi-əza Zeynəbə.

Keçib bir zaman döndü aylar ilə,
Fələk Zeynəbi saldı çox müşkülə,
Olub Kərbəlada çətin mərhələ,
Enib təlli gəldi xanım məqtələ,
Ağarmış saçın aldı fövrən ələ,
Olub eşq o dəm rəhnüma Zeynəbə.

Baxıb gördü bir qana batmış bədən,
Düşüb isti qum üstünə bikəfən,
Nə baş var bədəndə nə salimdi tən,
Saçır gün, yox əynində bir pirəhən,
Dedi ey rəhi-həqqidə can verən,
Nədən etmirsən e`tina Zeynəbə.

Rəhi-eşqi rövşən sirac eylərəm,
Cahanda qiyamın rəvac eylərəm,
Yaxıb qanını başa tac eylərəm,

Yaram çoxdu qardaş, əlac eylərəm,
Bu göz yaşıdır kimya Zeynəbə.

Cahanda Hüseyn, yarü-dildarınam,
Həmişə müridü tərəfdarınam,
Bilirsən yaman gündə ğəmxarınam,
Göz aç bax məni-zarə zəvvarınam,
Ölüb qardaşın, mən ələmdarınam,
Çatıb indi qanlı liva Zeynəbə.

## *Zeynəbin (ə) vəfatı*

Tərk edir, az qalır Hüseyn, tirə cahanı Zeynəbin,
Gözləri axtarır səni, Fatimə canı, Zeynəbin. [2]

Əlli beş ildi sayəndə daldalanmışam,
Eşqinə dəstgir olub şəhərləri dolanmışam,
Şəmi yanıb xəmuş olar, mən ki, həmişə yanmışam,
Əlli beş ildə sönməyib suzi nihanı Zeynəbin.

Az qalır yumulmağa əşk təri axan gözüm,
Meylə qüssə sürməsin kipriyinə yaxan gözüm,
Qətligahında nəşinə həsrətilə baxan gözüm,
Müntəzirindi didə əşk feşanı Zeynəbin.

Şama uzaqdı Kərbəla, çoxdu əgərçe fasilə,
Sən ağasan uzaq yolun zəhmətini qəbul elə,
Bir yol işim düşüb sənə, gəlməsən eylərəm giley,
Qəmli başın diz üstünə yoxdu alanı Zeynəbin.

Hər bacı can verən zaman mən kimi olsa dərbədər,
Sağü-sola baxar gözü, qardaşın arzu edər,
Qardaşı dəfnə gəlməsə qəbrinə nagiran gedər,
Gəl nigaran gedir bu gün ruhu-rəvanı Zeynəbin.

Mən dedim ömrümün gülü izzətilə solar Hüseyn,
Türbətini öpər bacın cami-səfa dolar, Hüseyn,
Qüssəli ruhu qüssədən orda xilas olar, Hüseyn,
Görmədi can verən zaman Kərbübalanı Zeynəbin

Sənsiz Hüseyn, yatanda mən hər gecə qəmlə yatmışam,
Qüssələrin düşüb yada öz-özümü oyatmışam,
Qədimi qəmlərin büküb pərçəmini ucaltmışam,
Adın olubdu dəmbədəm virdi-zəbanı Zeynəbin.

Suz qəmində qəlbidən ud kimi alışmışam,
Harda deyiblər adına xarici mən danışmışam,
Harda salıblar müşkülə itrətini çalışmışam,
İzzətilə dolandırıb ali-əbanı Zeynəbin

## *Zeynəbin (ə) dərdi-deli*

Mən Zeynəbəm, sabit qədəm yolumda,
Çəkildim bəzmi-zülmə ip qolumda,
Vətəndə hər yerə qonaq gedəndə,
Yeddi qardaş gedirdi sağü-solumda.

Mən Zeynəbəm, Hüseynə həm rəviyyə,
Böldük gələn bəlanı bis-səviyyə,
Zəhmət çəkib iki gül bəslədim mən,

Əkbərinə Əsğərinə hədiyyə

MənZeynəbəm, Müsibətlər anası,
Pənc tənin məclisinin səfası,
Mən kimi bəxtəvər yoxuydu, amma,
Pir eylədi Kərbübəla bəlası.

Mən Zeynəbəm , əimmə iftixarı,
Dolandım küçə bazarı diyarı,
Xoş olmadı cahanda ruzigarım,
Yoruldum mən, yorulsun ruzigarı.

Mən Zeynəbəm, varım birdən yox oldu,
Dil yarəsi mənə misli-ox oldu,
Yaman günün deyillər ömrü azdı,
Mənim amma yaman günüm çox oldu.

Mən Zeynəbəm, əzizi ali-yasin,
Əziz etdim Hüseynimin əzasın,
Əzalıydım, ölüncə qara saldım,
Qüssə açdı bu başımın qarasın.

Mən Zeynəbəm, yandı qəlbim kül oldu,
Ömrümün hər günü mənə il oldu,
Xarabada Səkinəm ac olanda,
Hər nisgildən mənə o nisgil oldu.

Mən Zeynəbəm, qəlbimə dağ çəkildi,
Üstümə hey müsibətlər töküldü,
Vətəndən ayrıldım başım ağardı,
Qardaşlarım öldü, belim büküldü.

## *Oxşama*

Bulud kimi dağ-daşlara axmaram,
Nə bir bağa nə gülşənə baxmaram,
Yaralı başını gördüm qocaldım,
Ölüncə mən başa həna yaxmaram.

Məzzəmət eylirəm həmişə göz yaşımı,
Doyunca oxşamadım yaralı qardaşımı,
Dəyəndə nizədə daş qardaşım Hüseyn başına,
Yarıldı məhmilə vurcaq bəla başımı.

Nə qədər var ömrüm sənə ağlaram,
Qəbrə gedəndə qarəni bağlaram,
Nə hala bu gül cismini salıblar,
Yerdə qalan cənazənə ağlaram.

## *Həzrət Zeynəbə(ə) salam (rövzə)*

Salam ola əlini xəncərə atan xanıma,
Bəla çölündə yaman günlərə qalan xanıma.
Salam ola şərəfilə hicabı hifz edənə,
Şücaətində Əbəlfəzlə oxşayan xanıma.

Salam ola ucaboy qardaşı ölən bacıya,
Günortaya kimi qəddi kaman olan xanıma.
Salam ola qocalan Zeynəbə yarım gündə,
Ölüncə ellərini hər gün oxşayan xanıma.
Salam ola qolu bağlı Yezidi xar edənə,
Qana batan ələmi Şamidə vuran xanıma.

## *Zəban halı Zeynəb*

Əzalıyam, günüm qaradı qardaş,
Nə qədər ağlasam səzadı,qardaş.
Öpənmərəm yaralı əllərindən,
Kəsibdi sariban yaradı, qardaş!
Sitəmlə gülləri solan canım vay,
Hüseyn qəmində baş yolan canım vay,
Günortaya kimi səhər çağından,
Xanımlığı yalan olan canım vay!

## *Oxşama*

Qəm selləri başım üstdən aşanda,
Mövcə gəlib dərya kimi daşanda,
Bu Şamidə birəhm olan cəmaət,
Gülərdilər qızların ağlaşanda.

Heç qoymadı üzüm gülə zəmanə,
Bülbül kimi döndü gülüm xəzanə,
Qolu bağlı qardaş dedim, dolandım,
Anam kimi döndü qəddim kəmanə.

Deyərəm gül solubdu,
Gülşəndə gül solubdu,
Başını Şümr aparıb,
Əllərin bəs nə olubdu?

Fərağında gecə-gündüz ağlaram,
Qəm dəftərin hey açaram, bağlaram,
Gül cisminə bu hədd yara vurublar,
Pərpər olan cənazənə ağlaram.

## *Şir qadın (Rövzə)*

Vəqti qarətdə imamı yanar oddan qurtaran,
Xahəri-şiri-zən süruri Bətha Zeynəb.
Məclisi-Kufədə şiva və rəsa məntiq ilə,
Qolu bağlı eləyən düşməni rüsva Zeynəb.
Əyməyən düşmənə baş, qardaşı məsləkdə olan,
Deli-züllamə sözü-xəncəri-bürran Zeynəb.
Əli qoynunda dolandı nə qədər çəkdi nəfəs,
Ömrünün gündüzü də çun şəbi-yelda Zeynəb.
Yektənə vurdu özün vərətətufaniqəmə,
Eylədi dini-Rəsulullahı əhya Zeynəb.

## *Oxşama*

Ağlaram, ağlar gözüm var,
Qəlbidə dərya sözüm var,
Nagiran olma, Hüseynim,
Hər bəla gəlsə, dözüm var.

Ay batdı mən batmaram,
El yatdı mən yatmaram,
Qurtarmayan dərdini,
Heç bir dərdə qatmaram.

Gül gözündən atma, qardaş,
Qumlar üstə yatma, qardaş,
Ey düşən yorğun, yaralı,
Zeynəbi ağlatma, qardaş.

## *Zeynəbin (s) Əbülfəzldən kömək istəməsi*

Gəl xeymələrim zülmilə odlandı, Əbülfəzl,
İmadad elə od içrə balam yandı, Əbülfəzl.

Dur, yatma Fərat üstə işim müşkülə düşdü,
Gəşti ümidim atam oğlu gələ düşdü,
İmdad eləyirdin hamıya iş belə düşdü,
Gəl indi mənim dövrəmi düşmənlər alıbdı,
Zeynəb sənə qurban, yaxam əllərdə qalıbdı.

Bikəs bacınam sən mənə imdad elə, qardaş,
Xeyməm yanır Zeynəbini yad elə, qardaş,
Od içrə yanan qızları azad elə, qardaş,
Bir gün vardı başımıza sayə salardın,
Avarə qalan qızları ağuşə alardın.

## *Zeynəbin (ə) şəhaməti ( rövzə)*

Nəyyiri-ə`zəm əflaki-vəfa Zeynəbdi,
Gövhəri-mə`rifət və hüccətü-həya Zeynəbdi.

Yaradıb Zeynəbi əvvəldən Hüseynçi yaradan,
İffətin dərsini almış o bəlakeş anadan,
Nəfsi-mərdanəliyi irs aparıbdır atadan,
Mürtəzanın adına zivər olan Zeynəbdi,
Anası Fatiməyə bənzər olan Zeynəbdi.

Butə eşqidə yandı əridi çün zəri-nab,
Oldu beş sinnidən amadə möhnət o cənab,
Yağdı baran bəla başına bi həddü-hesab,
Zülmlə əlləri qoynunda qalan Zeynəbdi,

Beş yaşından başına qara salan Zeynəbdi.

Hökmi-təqdiri qəza aldı əlindən anasın,
Bəzmi-matəm qurulub açdı o qəmkeş yaxasın,
Əvvəlin bar eşidib quş fələk oxşamasın,
Üzə gözdən əliyən xuni-cigər Zeynəbdi,
Mələyən həsrətilə şamü-səhər Zeynəbdi.

Gecələr ki, sataşardı gözünə göydəki ay,
Hey deyərdi evimi sani yıxıb, Allah haray,
Qəbrə həsrət əli qoynunda gedən vay nənə vay,
Yuxudan hər gecə əfsürdə duran Zeynəbdi,
Qüssəli madərə qəm bəzmi quran Zeynəbdi.

Getməmiş xatirəsindən hələ Zəhra anası,
Qoymadı çərxi-cəfa pişə sağalsın yarası,
Məscidi-Kufədə əl-qana boyandı atası,
Çak edən qüssəvü-qəmdən yaxasın Zeynəbdi,
Bağlayan şiri-Xudanın yarasın Zeynəbdi.

Az zaman keçmədi artdı yenə dərdü-mühəni,
Cödə şumü-dəğa eylədi zülmün ələni,
Zəhri-cansuz salıb dildən İmami-Həsəni,
Nimə şəb izni-verən göz yaşına Zeynəbdi,
Ağlayan həsrətilə qardaşına Zeynəbdi.

Ömrü bir müddət onun oldu bu növi sepəri,
Axdı gözdən üzə hicr aləmi xun cigəri,
Gün o gün oldu düşüb Kərbu-bəlaya güzəri,
Hər bəla səhnəsinə nazir olan Zeynəbdi,
Hər müsibətdə o gün hazır olan Zeynəbdi.

Zöhrü Aşura bəla yandı deli-zari-onun,
Birbəbir qana batıb yavərü-ənsarı onun,
Qanlı qudala düşüb sərvəri-saları onun,
Ələm ahını təll üstə saçan Zeynəbdi,
Qətlgaha əli başında qaçan Zeynəbdi.

Bir zaman qətlgaha çatdı o deli-zarü-qəmin,
Gördü can üstədi qudalidə qardaşı Hüseyn,
Əyləşib sinəsi üstündə onun Şümri-ləin,
Şümri-bəd əxtərə ixtar eləyən Zeynəbdi,
Özün amadeyi-peykar eləyən Zeynəbdi.

Ağladıb möhnəti cənnətdə xanım Fatiməni,
Eşqin isbat eləyib aləmə Zeynəb Əlini,
Çeşmi-gərdun görə heyhat belə şiri-zəni,
Olmayan dəhridə təslimi bəla Zeynəbdi,
Fateh və şiri-zəni-Kərbübəla Zeynəbdi.

Gərçe axırda Hüseyn dərdi onu pir elədi
Qüssələr yordu yaman yerdə zəmingir elədi,
Qardaşın nehzətin aləmdə cahangir elədi,
Yeddi qardaşı ölən qəlbi yanan Zeynəbdi,
Şiddəti-qüssəvü-qəmdən qocalan Zeynəbdi.

Gün o gün oldu düşüb bəstəri-mərgə nigaran,
Səslədi qardaş Hüseyn, hardasan ey cismimə can,
Ölürəm gəl başım üstə məni yox qəbrə qoyan,
Sənin hər yerdə Hüseyn, yarın olan Zeynəbdi,
Zülfünü nəşinin üstündə yolan Zeynəbdi.

## *Zeynəbin (ə) vəfatı*

Tutub üz sahati-Pərvərdigara,
Dedi mən neyləmişdim ruzigara,
Qalıb həsrət üzüm el-təbara,
Gələn yoxdur mülaqatıma, ya Rəbb,
Tək evdə can verir məzlumə Zeynəb.

Gəlib şura Hüseyn eşqi başımda,
Əsər vardı yəqinən göz yaşımda,
Gözüm var hamıdan çox qardaşımda,
Sərəfraz et məni sal yada, qardaş,
Çətin vaxtımda gəl fəryadə, qardaş.

Nə müddətdir çəkər göz intizarın,
Mülaqatı şirindi yara-yarın,
Köməksizdi qəribi-biqərarın,
Bu həsrətdə axır əşkim üzara,
Özün gəl Zeynəbi tapşır məzara.

Bir ömür oldu sənə Zeynəb tüfeyli,
Əzizim, gəlməsən ollam gileyli,
Dalınca yolladım mən əşki-seyli,
Əliləm, bimüinəm, başsızam mən,
Görən fikr eləyir qardaşsızam mən?

## *Həzrət Zəhranın Əbulfəzl başı üstünə gəlməsi*

Həzrət Zəhradan aldım muzdumu, padaşımı,
Başıma qoydu əlin, ərşə yetirdi başımı,
İzn verdi tez çağır gəlsin imam haşimi,
Səsləməzdin bi icazə yoxsa mən qardaşımı,

Yaxşı imdad elədi Xeyrün-nisa Əbbasidən.

Aldı Əbbasın səsin, verdi Hüseyn fil-fövri səs,
Aşyanından haman eşq olubdur bihəvəs,
Üz qoyub meydana dildə ah çəkdi hər nəfəs,
Qıl kömək ya Rəbb dedi yoxdur mənə dadrəs,
Naümidəm, ey Xudayi-kibriya Əbbasidən.

Gəzdi meydanı yetib dildən düşən səqqasına,
Nəqş olub gördü vucudu Kərbəla səhrasına,
Baxdı qolsuz peykərə məcruh olan ə`zasına,
Ləblərin öpdü qoyub simasını simasına,
Gödü səs gəlir gözü başı yarə Əbassidən.

## *Həzrət Əbulfəzlin (ə) zəban halı Rövzə)*

Səs ver səsimə, qətlimə qardaş tələsən var,
On yeddi nəfər bir yaralı başı kəsən var,
Mə`nadə anam Fatimə, qardaşım Həsən var,
Bu məhfili-alidə yerin boşdu yubanma.

Gahi dəyib ox, gahi dəyib daş bədənimdən,
Qan su tək axır torpağa qardaş bədənimdən,
Tə`xir eləsən ayrılacaq baş bədənimdən,
Sdəmə yetə ənguştərə qaş saxlaya bilməz,
Bir cismiki,qolsuz qala baş saxlaya bilməz.

## *Ərze-hacət (rövzə)*

Gəl başım üstə olsa Hüseyn can, ləyaqətim,
Axır nəfəsdə vardı sənə ərz-hacətim.
Çox mayiləm dübarə görüm məh cəmalını,
Qoyma ürəkdə qalsın amandır bu həsrətim.

Sən şahisən gələndə ayağa duranmasam,
Mə`zur et ki, qəlbidə yox ayrı niyyətim.
Bir hala qalmışam ki, özüm şərh edəmmərəm,
Yoxdur ayağa durmağa bu dizlərdə taqətim.
Əfv elə xeyməgahə sarı gələmməsəm,
Nazlı Səkinədən bilirsən var xəcalətim.
Sə`y elədim ki, məşkə xətər yetməsin, vəli,
Məşk oxlanıb dağıldı su, heyf oldu zəhmətim.
Qolsuz yıxılmışam yerə, düşmənlərim gəlir,
Tab eyləyəmmirəm, məni öldürdü qeyrətim.
Hasil gəlibdi dada Hüseyn şahi-teşnəqan,
Səsləndi aç gözün məni çox etmə bağrıqan.
Qan laxtası yumub gözünü heyf görəmmisən,
Salmış nə hala fovci-bəla qəmgüsarini.
Aç qanilə dolan gözünü göz-gözə baxaq,
Bir də görüm doyunca o çeşmi-xümarini.
Çox olma del qəmgin ki, ayağa durammısan,
Salma özünü zəhmətə ki, bildim işarəni.
Ətşan Fərata daxil olub içmədin sudan,
Artırdı dəhridə bu əməl e`tibarini.
Nazlı Səkinəm indi çəkir intizarini,
Gördü Hüseyn yoxdu dəxi rahi-çarəsi.
Tab eləmir bu qəmdə deli parə-parəsi,
Ağlar gözilə durdu ayağa o didətər,
Üz qoydu xeyməgaha tərəf zarü-xuncigər.
Qoyduqca hərdəm yerə ahəstə səslənir,
Qardaş ölümü qardaşın axı belin bükər.

## *İmamın zəban halı rövzə)*

Səsləndi gəl bacı, evimi yıxdı qovmi-kin,
Əbbasım öldü kama çatıb qovmi-xirə-sər.
Yandı dilim, büküldü belim,öldü qardaşım,
Əbbasın ölməyin ver özün qızlara xəbər.
Amma Səkinədən bacı çox-çox müvazib ol,
Bu qüssədən balam özün axır həlak edər.
Su üstə verdi bir göz iki qol o bavəfa,
Qoydu sizi qara günə bu çərxi-fitnəgər.

## *Əbbasın balinində İmamın zəban halı*

Qalan çöldə adamsız qardaşım vay!
Yatan qan içrə yarü-yoldaşım vay!
Səni kim saldı bu hala Əbülfəzl,
Gözündən ox dəyən vay qardaşım vay!

Belim sındı səni qolsuz görəndə,
Sinəndən oxları bir-bir dərəndə,
Xəcalət ölməyin nisgilli oldu,
Dönüb əxyamə baxdın can verəndə.

Edər ahım əsər almasa Zeynəb,
Çağır gəlsin anamı yasa Zeynəb,
Yığışsın qızlarım bu xeyməgaha,
Hamımız ağlayaq Əbbasə, Zeynəb.

## *Əbbasın (ə) zəban halı*

Yerə qoy başımı sinən olub qan,
Özün də xəstəsən ey şahi-ətşan,
Bu axır ləhzədə bir xahişim var,
Ölüncə başıma rahat verim can.

Fələk qoysaydı əxyamə gedərdin,
Ürəkdə bu səbəbdən çoxdur dərdim,
Əlim olsaydı qalxıb saxlayardım,
Gələn oxdan su məşkin hifz edərdim.

Yıxıldım düşmənim əl çaldı, qardaş,
Bu qovğadan fələk kam aldı, qardaş,
Məni çox ağladan bu nisgilimdir,
Bacım Zeynəb daha tək qaldı, qardaş.

Neystanə tərəf çəkdim üqabı,
Dolandırdım döşümdə məşki-abı,
Səkinəndən əxa, şərməndə oldum,
Özün aram elə ol delkəbabı.

## *Əbbasın (ə) zəban halı*

## *(Yaralı sinə)*

Səsləndi mənim düşdü işim müşkülə qardaş,
Düşmən bu başım üstə edər həlhələ, qardaş,
Qoyma yaralı baş düşə əldən-ələ qardaş,
Tez gəl sürünüm mən qabağında üzü üstə,
Əfv eylə dura bilməsə Əbbas ayaq üstə.

Aldı səsini qardaşım,can dedi qardaş,
Din üstə düşən qollara qurban dedi qardaş,
Gəlləm sənin imdadına əlan dedi, qardaş,
Nə halilə Allah bilir mindi at üstə,
Nəhr üstə yetirdi özünü şahi-xocəstə.

Endi yerə at üstdən ol şəhpərin öpdü,
Baxdı yumulan gözlərinə gözlərin öpdü,
Teşnə idi Əbulfəzl, quruyan ləblərin öpdü,
Yanır sənə baxdıqca yanır yarəli sinəm,
Əxyamidə gözlər yolunu nazlə Səkinəm.

Mən Əbbasam, mənə səqqalar ağlar,
Susuz əhvalıma dəryalar ağlar,
Mənim hicranım ağlatdı Hüseyni,
Ədəbli nökərə mövlalar ağlar.

Hüseyni heç kəs haraya Əbulfəzl tək səsləməyib,
Salanda möhnətini yada nəm-nəm ağlamışam,
Otuz dörd ildi ya mövla demişdi sözünü,
Vəli deyillər başı sınanda çağırdı qardaş.

## *Həzrət Fatimə (ə) Əbəlfəzlə zəban halı*

Sən başında yara vardı, mən başımda qara var,
Sən düçar oldun əmuda, mən dözüm mismara,
var,
Gəl qucağıma ki, hər dərdə oğul, bir çara var,
Halımı amma müraat et, döşümdə yara var.

## *Əbəlfəzlin (ə) zəban halı*

Ağlamaram peykərim qolsuz qalır,
Ağlamaram nənəm oğulsuz qalır,
Bu qəm mənə müşkül olub hər nədən,
Mən gedirəm Hüseynim yalqız qalır.

## *Hüseynin (ə) sözü*

Mən demirəm məşkūvü doldur gedək,
Mən demirəm Səkinəm ağlır gedək,
Qolun yoxdu təkyə eylə çiynimə,
Düşmən baxır yavaş-yavaş dur, gedək.

Qəhrəmanam qədrimi sındırmayın,
Yaralıyam yolum üstə durmayın,
Xəncər yarasına, oxa dözüm,
Namərdilər, dil yarası vurmayın.

Anam gəlib məhəbbət etdi, qardaş,
Çətin zaman haraya yetdi, qardaş,
Medali-iftixarıdır sinəmdə,
Gözüm-qolum su üstə getdi, qardaş.

## *Hüseynin (ə) zəban halı (nöhə)*

Əbulfəzlim ölübdür gəl bacı, ağla yana-yana,
Düşübdür qardaşım nəhri-Fərat üstə biyabana,
Axır bu göz yaşım, ölübdür qardaşım,
Qalıbdır ərsədə vəfalı yoldaşım.

Gedibdi izzətim əldən, yoxumdu yarü-ənsarım,
Nə vardır Əkbərim nə Qasim və nə qolsuz
ələmdarım,

Axır bu göz yaşım  ölübdür qardaşım,
Qalıbdır ərsədə  vəfalı yoldaşım.

Əbulfəzlim öləndən ağlayır bu gözlərim, Zeynəb,
Qalıbdır dağlı sinəmdə yanıqlı sözlərim, Zeynəb.
Axır bu göz yaşım  ölübdür qardaşım,
Qalıbdır ərsədə  vəfalı yoldaşım.

## *Hüseynin (ə) zəban halı (rövzə)*

Əbbas, mən bəradəri-del dağdarınam,
Sən məst cami ləm yəzəli mən xumarınam,
Mehman gələn zaman tanışı dindirər tanış,
Qurban olum şirin dilinə mənlə bir danış,
Mən bel sınıq sənin də cəbinin sınıb belə,
Mən çarə eyləyim anuva, bu sınıq belə.

## *İmamın zəban halı (nöhə)*

Aç o şəhla gözün bax mənə, qardaş Əbülfəzl,
Səslə qardaş, deyim can sənə, qardaş Əbülfəzl.
Qaldım bu çöldə tənha, bəradər,
Öldün sevindi ə`da, bəradər.

Ey atam oğlu, ey münşiyidərbarım Əbbas,
Ey ucaboy, uzunqol sipəhsalarım Əbbas,
Ağlaşır xeymədə gör necə qızlarım, Əbbas,
Dur aman vermə bu düşmənə qardaş, Əbulfəzl,
Qaldım bu çöldə tənha, bəradər,
Öldün sevindi ə`da, bəradər.

Ruca qaməti bavərim yoxdur yıxıblar,
Xətt mərdanigidən qoşun, qardaş çıxıblar,
Üstünə sarı çox nizə və xəncər vurublar,
Qoy çəkim peykərin mə`mənə,qardaş Əbulfəzl,
Qaldım bu çöldə tənha, bəradər,
Öldün sevindi ə`da, bəradər.

Qolların agaham, zülmilə meydanda düşdü,
Sağ qolun saldılar vəlvələ, hər yanda düşdü,
Qolların düşcəyin pərçəmi Qur`an da düşdü,
Bu ələm çatmaz əhrimənə, qardaş Əbulfəzl,
Qaldım bu çöldə tənha, bəradər,
Öldün sevindi ə`da, bəradər.

## *Sərvi-qamət*

Dərdi dərmansız olan, səslə Əbülfəzl ağanı,
Getmə birahə dayan, səslə Əbülfəzl ağanı.

Naümüd olma Əli oğludu bu himməti var,
Sərv qamətdi, uzun qollara bax qüvvəti var,
Vəhşətə saldı otuz min qoşunu, qeyrəti var,
Nigaran olma gilən, səslə Əbülfəzl ağanı.

Otuz il Fatimənin oğlunu mövla çağırıb,
Demə aşiqləri imdadına bica çağırıb,
Təllin üstündə bunu Zeynəb-kübra çağırıb,
İşi müşküldə qalan, səslə Əbülfəzl ağanı.

## *Müşkül açan*

Hüseynin ey rəşidü-bavəfası,
Ələmdarı, sipəhdarı, əxası.
Cahanda şöhrəti babül-həvaic,
Əlacı olmayan dərdin dəvası.
Sənin tək gəlməyib dünyaya qardaş,
Hüseynə can dedin, oldun fədası.
Əlinin qəhrəman oğlu Əbülfəzl,
Olan bu kəslərin müşkül goşası.
Hayanda zikr olunsa nami-pakın,
Behiştə bənzər ol bəzmin səfası.
Məhərrəmdi, hamı qara geyiblər,
Çıxar ərşə Hüseynin vay sədası.
Kimə dərdin desin bu ağlayanlar,
Təvəccüh et, səni Zəhra balası.
Qapından heç kimi rədd etməyibsən,
Bu cəmin vardı səndən iltiması.
Bizim də dərdimiz var, can Əbülfəzl,
Əzadarın sənə qurban, Əbülfəzl.

## *Qəməri-Bəni Haşimin zəban halı*

Göz açdı gördü Əbulfəzl İmamı qan ağlayır,
Əli belində qalıb sərvəri ürək dağlayır.
Dedi sən ağlama mövla, ədüv baxar sevinər,
Yaralı qəlbim əxa, can verən zaman döyünər.
İcazə versən əgər düşməni utandıraram,
Dişimdə bu ələmi başına dolandıraram.
Xəcalət oldum əxa, birbəbir susuzluqdan,
Aparma şərm edirəm mən həyalı qızlardan.
Bu Şümrü mən tanıram xeyməgahı yandıracaq,
Bəlalı Zeynəbimi hər bəhanəyə vuracaq.

## *Cavabı imamın (ə)*

Bu məşkini aparım xeymədə susuzlarıma
Nişan verim ələmi, məşki-abi qızlarıma.
Necə deyim bacıma qardaşımı doğradılar,
Necə bəyan eləyim sağ gözünü oxladılar?
Səkinə görsə əgər məşkini fəğan edəcək,
Ayaqyalın, baş açıq qətligahına gələcək.
Ayağa dur atam oğlu, qalıb belimədə əlim,
Düşəndə sən atın üstdən mənim də sındı belim.
Vəfalı qardaş idin, heyf ola süzüldü gözün,
Çıxıbdı can bədənindən, solubdu qanlı üzün.
Başına mən dolanım bağrıqan Əbülfəzlim,
Qum üstə yatma oyan, mehriban Əbülfəzlim.

## *Yaralı namavər*

Mümkün olsa özünü rəzmgaha fövri yetir,
Şahbazın yıxılıb sədmə görüb şəhpərdən.
Gözümün ağ-qarasın qana qatıb tiri-se pər,
Dəxi səlb oldu təvan yaralı namavərdən.
Gah vurullar məni nizə ilə gahi xəncərilə,
Görmürəm ta özümü hifz eliyəm xəncərdən.
Ox atanlar məni indi kamanilə vurur,
Nə həya etdilər məndən nə də Peyğəmbərdən.
Ayrılıq vaxtıdı gəl bir də doyunca danışaq,
Kami-del qəvi əl-Əbbas dəm axirdən.
Göz ki, görmürdü o dəm qardaşın ətrin aldı,
Pişvaz istədi etsin o susuz sərvərdən.
Taqəti olmadı əfsus, ayaq üstə dura,
Bu qiyamət ona balatər olub məhşərdən.
Dedi əfv eylə ağa, durmağa yox imkanım,
Yaralar vermir aman ta duram axır yerdən.

Çarəm olsaydı hüzurunda ağa, yatmazdım,
Keç Əli Əkbərə xatir yaralı nökərdən.
Lütf eylə yoxdu əlim gözlərimin sil qanın,
Qoy çatım qəlbidəki məqsədə bu məhzərdən.
Üzünə baxmaq Hüseyn, eyni səadətdi mənə,
Etmə məhrum məni feyzi ruxi ənvərdən.

## *Əba Əbdullahın zəban halı (rövzə)*

Bir oxşama deyim sənə aşiqlər ağlasın,
Atdan yıxılsa kim, yerə əvvəl atar əlin.
Alnın, üzün baxıb görürəm parka-parçadı,
Versin eşitsə kim başına biqərar əlin.
Müşkül olar sənə uca yerdən yıxılmağın,
Ovraq olar qoy bədənin salsalar əlin.
Gördüm bir iş bu çöldə səni istəyənlərə,
Əhli-hesab işimə verdim əyar əlin.
Qiymətli bildi qardaşının əllərin Hüseyn,
Zəhraya verdi saxlamağa yadigar əlin.

## *Əba Əbdullahın (ə) zəban halı*

Nələr oldu yıxılıb səslədi ədrikni əxa,
Səsini aldı gəlib qətlgahə miri-hüda,
Qəm olan əlləri bir-bir götürüb etdi nəva,
Dedi ya Rəbb, nə qəməfzadı Əbülfəzlin əli.

Busə etmişdi olan gün bu iki əldən atam,
Sayəsində demişdi məni asudə yatam,
İş belə gəldi ədü qoymadı məqsudə çatam,
Öpürəm, qəlbimə yaradı Əbülfəzlin əli.

Bu kəsik pəncələrə istəyirəm yaxşı baxam,
Ruzi-məhşərdə ala sinəsinə xeyrün-nisa,
Pak əzadara şəfaət edib oddan qurtara,
Görələr zinəti üqbadı Əbülfəzlin əli.

## *Həzrət Əbulfəzlin (ə) həzrət Zeynəblə (ə) söhbəti*

Ol şəbdə ağam hər sözü minbərdə dedi,
Yarü-ənsarına hər mətləbi bipərdə dedi,
Teşnələb öldürəcəklər bizi bu yerdə dedi,
Zibh olan başlarımız neydə bədənsiz qalacaq,
Soyulub peykərimiz yerdə kəfənsiz qalacaq.

Ölən oğlanlarına ağlayacaqlar analar,
Sən özün də olacaqsan ağama tə`ziyədar,
Fikr elə, gör bu Əbulfəzlin aya kimi var,
Burda olsaydı anam zəhmətim olmazdı sənə,
Yox mənim ağlayanım, lütf eləsən ağla mənə.

Qardaşımsan, sənə şəxsən mən özüm yas tutaram,
Qəm yemə, Ümmi bənin yoxdu əgər, mən ki, varam,
Nigaran olma Hüseyndən sənə az ağlamaram,
Nə`şinin üstə o qədri edərəm dadü-ənin,
Həm anam Fatimə razı ola, həm Ümmi bənin.

Söz belə qaldı olub çatdı mahi-əza,
Qətligaha dövrələrdən yerə endi üsəra,
Məst edib qəmzədə bülbülləri ətri-şühəda,
Hər bir yanda gülün tapdı həmağuş oldu,

Çeşmələr çeşmə zəmzəm kimi porcuş oldu.

Hamı məşğul o çuxur yerdə olub ağlamağa,
Gördülər gah sola Zeynəb baxır, gahi sağa,
Nagəhan durdu xanım otduğu yerdən ayağa,
Pozmasın məclisi etdi bəyan bu gedişim,
Nəhri-Əlqəmdə Əbülfəzlimlə vardı işim.

Üz qoyub məqtəli-Əbbasa pərişan Zeynəb,
Yetişib gördü əcəb mənzərə var ya lil-əcəb,
Bir xanımdır oturub başda qara çadır şəb,
Baxır əlsiz bədənə zikri fəqət oxşamadı,
Elə ağlayır elə bil oğlu ölən bir anadı.

Dedi kimsən oturubsan bu biyabanıda tək,
Məskənin Kərbübəladır məgər ey qara ləçək,
Göz yaşın axdıqca eylər Zəhray kömək,
Gəlisən şiddətilə naləyə, titrir bədənin,
Mislinki, dağılan peykər öz oğlundu sənin.

Zeynəbim oxşayasan yaxşı əziz qardaşını,
Sözünün suzişi rüxsarə çəkər göz yaşını,
O xanım ziccə çəkib birdən ucaltdı başını,
Dedi gəl ver mənimlə başbaşa mən Fatiməyəm,
Qızıyla xoşdu ana ağlaşa, mən Fatiməyəm.

Neçə gündür mənə məskəndi qızım, Kərbü-bəla,
Nöfəlin zülmü salıbdır balamı gör nə hala?
Mən deyim oxşama, ya sən deyisən qəmli bala,
Sən denən bu dağılan cismə hüma sayəmdi,
Mən deyim əlləri məhşər günü sərmayəmdi.

## *Zəhərli ox*

Ox dəyib sağ gözümə süzülür qanı Hüseyn!
Əllərim yox çıxardım qanlı peykanı Hüseyn!

Gör necə səlb eləyib bu ox əldən dözümü,
Kimə səndən sora mən faş edim del sözümü,
Gəl özün xaric elə incidir ox gözümü,
Axtarır indi gözüm məhi-tabanı Hüseyn!

Dedim ey zəhərli ox, qəmü-hirman yeridi,
Eşqin əs-saə mənə səxtü-böhran yeridi,
Sən qədəm qoyma bu göz şəhixuban yeridi,
Dərdimin həşrə kimi yoxdu dərmanı Hüseyn!

Hey dedim bircə dayan izzu-cahım gələcək,
Çək kənara özünü dadixahim gələcək,
Başımın üstə yəqin teşnə cahım gələcək,
Ağlayıb ağladacaq hamı dünyanı Hüseyn!

## *Nənəsi Ümmül-bənin*

Ey gözüm, cari elə xun deli zarı yerə,
Yıxdılar atdan uzun qollu ələmdarı yerə.

Uca yerdən yıxılan vaxtı birin görsəz əgər,
Qoyar əvvəldə bu mə`lumdu qolları yerə.
Olmadı əlləri versin yıxılanda qabağa,
Üzü üstə gəlib peykəri-xunbarı yerə.
Sən özün fikr elə aya necə ünvan eləyim?
Dəydi çox möhkəm onun surəti-gülnarı yerə.
Üz tutub xeyməyə səsləndi o deldadə əxa,
Qoy əlində su əgər olsa da icbarı yerə.

Mənə xatir demirəm gəl ananın xatirinə,
Gün kimi cilvə verir pərtuvi-ənvarı yerə.
Göyərib surəti nilufərə bənzər üzü var,
Mən kimi dəymiş onun olmaya rüxsarı yerə,
Ya vurublar üzünə sili dolub qan gözünə,
Sili tutsa yıxar hər övrəti bardarı yerə.

## *Heydər balası (rövzə)*

Ağam Əbbasın uca qamətinə can qurban,
Canını verdi vəli,qoymadı tək cananı.
Heydərin babül-həvaic balası şir oğlu,
Kaşifül-kərbidi bu mülki-vəfa sultanı.
Çox çətin müşkülüm olsa ətəyindən tutaram,
Sən də tut nazlı Səkinə yapışan damanı.
Nəfəsi el dayağıdı, özü ləşkər qabağı,
Odu eylərdi dua Zeynəb o məhi-simanı.
Hey deyərdi səni çox görməsin Allah bacına,
Kimi var Zeynəbin ey gözlərinin qurbanı.
İndi bir möhnəti var ərz edirəm yəbnəl-Həsən,
Məni əfv elə çətindir bilirəm ünvanı.
Üçpər ox bir nigaran göz nə sipər var, nə əli,
Göz evindən necə xaric eləsin peykanı.
Dizlərin qovzadı tutdu oxu bir verdi təkan,
Çıxmağı müşküldü parçalanıb pişanı.
Yenə üzr istəyirəm yəbnəl Həsən, bu sözümə,
Bilirəm qəlbi-şərifindən alır yaranı.
Bir açıq başın əmudilə məgər nisbəti var,
Necə mən şərh eləyim bu mühəni-üzman?
Atın üstdən onu torpağa əmud oldu yıxan,
Bürüdü qırmızı qan mahi-cahanaranı.
Biri düşsə uca yerdən ona əl lazımdı,

Ki, hayil edib görməyə çox izanı.
Olmadı əlləri, dəydi üzü üstündə yerə,
Var əgər Ümmi bənin bilsə belə cəryanı.
Çox çətin vaxtda hər kəs çağırar öz kəsini,
Səslənər dadına vazehdi bu söz ə`vanı.
O qədər ali-Əlidən birini səsləmədi,
Dil tuta-tutmaya səsləndi xanım Zəhranı.
Atın üstən yıxılanda çağırıb ya Zəhra,
Başı üstündə görüb Fatimə üzmanı.
Dedi gəl yaxşı gəlibsən ana qurban olum,
Əcəba yad elədin sən bu bəla gərdanı.
Elə bir zaman gəlibsən nə gözüm var, nə əlim,
Acizəm, neyləyə billəm dəxi bu ə`danı?

## *Qəm günləri (rövzə)*

Qəm əyyamilə gərçe bu dilim porqəmdi,
Bir Hüseyn adlı ağam var, ürəyim xürrəmdi.
Aləmi gözdən atıb bir ona bel bağlamışam,
O gözəl adına qurban, şərəfi adəmdi.
Qapısından bilirəm saili boş qaytarmaz,
Çün kərəm sahibidi, sibti şəhi-əkrəmdi.
Köynəyin sailə ehsan edənin oğludu bu,
Bizi etməz əli boş, qorxma sözüm möhkəmdi.
Gəzərəm dildə Hüseyn adı əzaxanələri
Bu Hüseyn vay səsi yovmiyə mənə həmdəmdi
Məkkə də olmasa qismət mənə, vardır nə qəmim.
Ağamın məclisi Məkkəmdi, gözüm, zəmzəmdi.
Dolanıb hər yeri gəlləm bu əza məclisinə,
Ya Hüseyn izni düxulimdi sirişgim yəmdi.
Ruzi məhşərdə sıxıllam ağamın sayəsinə,
Yandıranmazlar məni, qəl`əi-müstəhkəmdi.

Sipəri-atəşi-iki dünya bu qara koynəyimiz,
Abrımız iki dünya bu qara pərçəmdi.
Bir Hüseynçi tanıram eşqinə heç kim çatmaz,
Adı Əbbasidi ol nəhri əlan ziqəmdi.
Başın üstə Hüseyn gəldi vəli beldə əli,
Gördü ə`zayi-cəvarih dağılıb bərhəmdi.
İkiəlli götürüb başını aldı dizinə,
Şaha başı ilə salam etdi sözü mübhəmdi.
Dedi Əbbasa uşaqlar yolunu gözlürlər,
Belə yatma yaralı, xeyməsəra matəmdi.
Mümkün olsa, səni Əkbər tək əbaya bükərəm,
Bu əba aləmdə görməli bir aləmdi.
Baxıram bu dağılan cismə əba yer verməz,
Neyləyim ağlamayım, qüssə mənə həmdəmdi.
O qədər dil dedi gətdi qərəz Əbbası dilə,
Dedi şaha bu başımdır bu da ki, sinəmdi.
Səni Zəhra əlini qoy bu dağılmış başıma,
Sora bir ayrı sözüm var ki, qəmi ə`zəmdi.
And verrəm ananın sili göyərdən üzünə,
Məni əxyamə aparma ki, yerim Əlqəmdi.
Məni qoy burda qalım məşki apar xeymələrə,
Ağladan çoxdu məni,dildə qəmi-müdğəmdi.
Belə fikr eylər uşaqlar ki, su içdim mən özüm,
Şahid ol içməmişəm,bir də Xuda ə`ləmdi.
Sənə layiq deyiləm heç demə qardaşdı mənə,
Demə mən şəm`i-vəfayam buda pərvanəmdi.
Yaralar ağzın açıblar sənə ləbbeyk desin,
Min belə yaram ola, bir baxışın mərhəmdi.
Sən əyil bir yol öpüm mən səni canım çıxsın, Can
dodağımda durub muntəziri-busəmdi.

## *Əbulfəzlin zəban halı (rövzə)*

Dedim bu təllin üstünü yol olsa bəlkə mən aşam,
Su məşkidən gedə-gedə uşaqlara yaxınlaşam,
Qalan suyu verəm ölüm, deyim bu xidmətə
xoşam,
İçə sudan balalrın deyə əmi-əmi,Hüseyn!

Xiyama gətligahdan qanilə arx açam gərək,
Vəfa ağacların onun kənarına saçam gərək,
Qiyamətin günündə də Səkinədən qaçam gərək,
Xəcalətəm, olammaram onuyla rubəru, Hüseyn!

Gərək xəyali-xeyməni bu saətimdə boşlayam,
Səkinədən uzaq gəzəm, kənari-nəhri xoşlayam,
Sənə başilə bir ələm, ona sərin su borcluyam,
Görəndə borclu-borclusun ölmədi arzu, Hüseyn!

Yadında var o Kufədə bizə bəla gələn gecə,
Başında yara Mürtəza ürəkləri bölən gecə,
Məni qulam edib sənə babam Əli ölən gecə,
Baxıb qulama ağlama, belə füsərdədir, Hüseyn!

## *Hüseynin zəban halı (nöhə)*

Səslədin sən məni dada, qardaş,
Aç gözün gəldim imdadə qardaş.
Ya Əbülfəzl, ya Əbülfəzl[2]

Taqətim yox bilirsən fərağa,
Qüssədən can yetibdir dodağa,
Düşmənim əl çalır dur ayağa,
Bir kəsim yox bu səhradə, qardaş.

Bir nəzər eylə bu bipənaha,
Gündüzüm döndü şami-siyaha,
Dur ayağa gedək xeyməgaha,
Sal susuz qızları yada,qardaş.

Fikri-dünyanı sən başdan atdın,
Sə`y edib aqibət kamına çatdın,
Su kənarında ləbteşnə yatdın,
Can nisar etdin azadə, qardaş.

Hifz edib məşki keçdin özündən,
Çıxmadın ta ölüncə sözündən,
Sancılıb üçpər ox sağ gözündən,
Gəlmişəm gör nə fəryada, qardaş.

Ey mənim qəm günüm, yoldaşım vay,
Düşdü sənsiz bəlaya başım vay,
Səslərəm vay cavan qardaşım vay,
Qalmışam tək bu dünyada qardaş.

Sən at üstdən üz üstə düşəndə,
Gördü Zəhra qolun yox bədəndə,
Səslədi ağlaram bu mühəndə,
Dadına gəldi Zəhra da, qardaş.
Ya Əbülfəzl, ya Əbüfləzl[2]!

## *Ümmül-bəninin zəban halı (nöhə)*

Yoldadı gözlərim,
Qəmlidi sözlərim,
Gəlmədi Allah, qəhrəman oğlum,

Harda qalıb bəs mehriban oğlum?

Var başımda qara, ürəyimdə yara, gedim mən hara,
Yola baxmaqdan bağrım qaraldı,
Gəlmədi Əbbas, rəngim saraldı.

Qəlbi qan anayam, günləri sayıram, od kimi yanıram,
Gəlmədi əcəl, ömrüm qurtardı,
Qəbrə gedərəm qəlbimdə yara.

Nə yamandı hicran, məskənim qəbristan, qalmışam mən heyran,
Allah, gedənlər nə çox yubandı,
İşim Bəqidə ahü-fəğandı.

## *İmamın bacısı ilə zəban halı*

Zeynəbim gəl ələmdarım öldü,
Ba şəhamət sipəhdarım öldü,
Müntəzir qalmasın şiri-xarım,
Qəhrəmani-vəfədarım öldü.

Həm sağından keçib, həm solundan,
Dönməyib vəli həqq yolundan,
Sinəsi üstə pərçəm əsirdi,
Qan süzürdü yerə hər qolundan.
Qan bu qəmdə gərək qəlbə dolsun,
Var yeri gül gülüstanda solsun,
Xeyməsinin yatırdın sütunun,
Qardaşım öldü, başın sağ olsun.

Sinəsi yaralı, baş yaralı,
Eləyib alnını daş yaralı,
Haqqı var ölməyə görsə qardaş,
Can verir teşnə qardaş yaralı.
Ox dəyibdir olub məşki parə,
Məşkinə ağlayır gözdə yarə,
Qeyrətə bax o halətdə gördüm,
Axtarır Əsğərə rahi-çarə.
Gördüm ağlır deyir can Səkinə,
Qara gözlü, qəmli ceyran Səkinə,
Get Rübaba deynən bağla qara,
Əsğərə yoxdu dərman, Səkinə.
Yat dedim yat ədəbli vəzirim,
Yat şərafətli, qeyrətli şirim,
Neylirəm gün də batsa batıbdır,
Batdı Əlqəmdə mahi-münirim.

## *Qardaş ağlama*

Yaralıyam yıxılmışam,
Düşübdü qollarım əxa,
Ağa əlin qoy alnıma,
Əlindi dərdimə şəfa.

Durammıram ayağına bağışla sərvərim, mən,
Qolum düşəndə başıma dəyib əmudi ahəni,
Dolubdu qanilə gözüm görənmirəm ağa, səni[2].

Başımı al qucağına verəndə can edim səfa,
Mənə gözəldi gəlməyin, başım ucaldı seyyidi,
Fələk nədən bu səmtidən yolumu saldı seyyidi,
Su xeyməgaha çatmadı,bacım qocaldı,seyyidi[2].

Eşitsə qardaşı ölüb necə dözər o binəva,
Hüseyn açıbdı qolların yaralını qucaqladı,
Öpüb əmmaməsiz başı sinəsi üstə saxladı[2].

Buyurdu qardaş,ağlama, vəli özü çox ağladı,
Bu dərdi yaxşı dərk edər ürəyinə dəyən yara[2].

## *Göz yaşı (rövzə)*

Tapdı oğlun o çətin vəqtidə del xəstə imam,
Dedi oğlum necə gör bikəs atan cana gəlib.
Evimi yıxdılar oğlum, sən əqəllən gözün aç,
Hər bəla vardı məni-zarü-nəvaxanə gəlib.
Atanı gör nə günə qoydu sənin dərdü-qəmin,
Bükülüb qaməti, göz yaşı dönüb qanə gəlib.
Yumulan gözlərin aç, dərdimə qıl çarə oğul,
Qoca vaxtında atan çarəvü-dərmanə gəlib.
Niyə dindirmirsən oğlum ürəyi qan atanı,
Fikr edirsən bala didarına biganə gəlib?
Yıxılan ərsədə sən can verən həsrətlə mənəm,
Bu ölüm başının üstə məni-nalanə gəlib.

## *İmamın zəban halı*

Cavanani-bəni-haşim, gəlin Əkbər batıb qana,
Vücudü pər-pər olmuş, gül kimi düşmüş
biyabana.
Aparın xeyməyə  bu gül bərg təri,
Görə əhli-hərəm  bu qanlı peykəri.

Mənim yox taqətim, oğlum ölüb, qəddim kaman oldu,
İşıqlı ulduzum ərşi-şəhadətdə nihan oldu.
Salıb dildən məni  bu dilbəndi-Rəsul,
Oğul vay səslərəm pərişanü-məlul.

## *Həzrət Hüseynin (ə) zəban halı*

Dur yatma qətligahida ey qəhrəmanım Əkbər,
Yox dizlərimdə taqət, ey mehribanım Əkbər.

Cəddim düşəndə yada fövrən sənə baxardım,
Cəddim şəbihi oğlum, qol boynuna salardım,
Peyğəmbəri Xudanın mən ətrini alardım,
Adın olubdur əlan virdi zəbanım, Əkbər.

Aç gözlərin Əli can, ollam gözün fədası,
Dəysin mənə bu çöldə ol gözlərin qadası,
Əndazədən çıxıbdır görrəm başın yarası,
Olsun sənə Əli can, qurban bu canım, Əkbər.

Zeynəb gəlib qabağa səslərdi can Hüseynim,
Ey Fatimə nişanı, ruhi-rəvan Hüseynim,
Oğlun ölüb, yoxundur tabü-təvan Hüseynim,
Yatmış əbanın içrə cismimdə canım, Əkbər.

Əllər başında səslər ol bülbüli Mədinə
Qurban olum deyərdi, qardaş bacın Səkinə,
Zülm etdi Kufə əhli mən bikəsü həzinə,
Ağzımda teşnəlikdən dönmür zəbanım, Əkbər.

## *İmamın oğluna zəban halı*

Dur yatma bu meydanda cavanım Əli Əkbər,
Qoyma çıxa hicrində bu canım, Əli Əkbər.
Əli can bala lay-lay.

Əxyamda gözləyər yolunu əmmələr, ağlar,
Olmuş bu qəmində bacılar didətər ağlar,
Bu halətinə o hərəmi xunciyər ağlar,
Ruzu-şəb olan virdi zəbanım, Əli Əkbər.

Aç gözlərini bax mənə ey cəddimə bənzər,
Qoyma yumula heyfdir oğlum, ala gözlər,
Gəhvarədə bu halına ağlar Əli Əsğər,
Yandırma məni ruhu-rəvanım, Əli Əkbər.

Səslədi cavanlarını meydani-bəlayə,
Ta Əkbəri həml eləyələr xeyməsərayə,
Salalar xeymədə gəl cisminə sayə,
Yoxdur vəli durmağa təvanım Əli Əkbər.

Ta yetdilər meydana ürək dağladı Əbbas,
Baxdı o yaralı balaya, ağladı Əbbas,
Ağuşa aldı, gözünü bağladı Əbbas,
Səslərdi əmi dur səni canım, Əli Əkbər.

## *Əkbərin imdad istəməsi (rövzə)*

Səsləyər baba, yetiş imdadıma bəs hardasan?
Əl-aman səs ver yanan fəryadıma, bəs hardasan?
Gəl yubanma xeymələrdən dadıma, bəs
hardasan?
Ah-naləmdən töküldü suz əgər torpağa,

Peykərindən qan axır dəşti-bəla səhrasına,
Qan tökür qüdsiyan insan kimi qovğasına,
Lalə nəqşin qan çəkibdir surəti-zibasına,
Ox dəyib yorğun düşüb meydanda əfsər torpağa.

Surətindən qan axır yoxdu yarasın bağlayan,
Vəhşəti Kərbü-bəladan qərqi-qəmdir asiman,
Qaməti şahzadəni puşeş edib tirü-kəman,
Gör nə halilə yıxıldı qanlı peykər topraǧa.

Əl-qərəz gəldi hicazın şahı meydana o gün,
Sərzəmini-Kərbəla gördü batıb qana o gün,
Qan veribdi Əkbəri ayini-Qur`ana o gün,
Başda bir yara düşüb manəndi Heydər torpağa.

## *Oğul qəmi (rövzə)*

Haraya Əkbərinin gəldi Seyyidüş-şühəda,
Alışdı yandı ürək, səsləndi va vələda.

Qərarü-səbrini dildən oğul qəmi aldı,
Qalanda yeddi qədəm torpağa özün saldı.
Süründü torpağın üstə o zarü-delxəstə,
Gəlib yetişdi cavan oğlunun başı üstə.
Sıxıldı qəlbi, cahan tirə tar olub gözünə,
Üzün qoyubdu o dəm mehriban oğul üzünə.
Dedi oğul, gözün aç hal zarını bildir,
Bəyana gəl, məni-bidad xahi bir dindir.
Yanır yanan ürəyim suzi iştiyaqında,
Bu qan nə qandi Əli, var gözəl dodağında.
Dedi ilahi, özün şahid ol bu əhvala,
Salıblar zülmilə gör Əkbərimi nə hala.

Bilirlər yalqız Hüseynin əlində yox çarəsi,
Görürlər oğlum ölüb hey vururlar dil yarası.
Məni salıbdı cavan oğlunun qəmi dildən,
Belə güman edirəm Əkbərim gedib əldən.

## *Əli Əkbərin başı üstündə İmamın zəban halı (rövzə)*

Axır nəfəsdi bir ata de, can deyim sənə,
Az qaldı cənnətə olasan rəhsipar, oğul.
Qəlbim çox istəyir açasan qanlı gözlərin,
Bir də görüm gözün giləsin aşkar, oğul.
Bir yol nigah edib yenə yumsan da yum gözün,
Baxsa oğul ata üzünə əcri var, oğul.

Ey məhzəri Rəzuli-Xudayi-cahan oğul,
Vey aftabi-ömrünə həft asiman oğul.
Yeddi qədəm cənazənin üstə sürünmüşəm,
Yetişmişəm bu gül bədənə nimə can oğul.
Ey ömrümün dadı, gözümün nuru, aç gözün,
Can üstəyəm gülür mənə bu kufiyan, oğul.
Tapşırmışam ki, qəbridə də bir yataq, Əli,
Sənsiz dözəmməz bilirsən, mehriban oğul.

## *İmamın (ə) zəban halı (nöhə)*

Dizim quvvəsi ay bala, gözüm ziyası ay bala,
Ayağa dur qocalmışam, əlim əsası ay bala [2].

O bağbanam od tutub yanıb fəğana gəlmişəm,
Əsibdi sərasər xəzan bu gülüstana gəlmişəm,
Solub gülüm, yanıb dilim, qəmində cana
gəlmişəm.

Gedibdi əldən ömrümün gözəl səfası, ay bala.

Oğul, şil olsun əlləri, səni bu hala kim salıb?
Bu zarü bi pənahidən qərarü-səbrü-tab alıb.
Göz aç oyan qərib atan cənazən üstə tək qalıb,
Ürəkdə dərdü-qüssəmin yox intəhası, ay bala.

Dəyibdi yara başına şeküftələndi lalə tək,
Düzüldü qətrə-qətrə qan o gül üzündə jalə tək,
Dolubdu laxta qanilə iki gözün piyalə tək,
Gələydi sinəmə mənim gözün qadası, ay bala.

## *Əli əkbərin (ə) vidası*

Xeymədən ki, nazilə Əkbəri çıxartdılar,
Rubəru qabağına Əsğəri çıxartdılar.

Gördülər Səkinəni qaçdı qəm otağına,
Çıxdı xeymədən alıb Əsğəri qucağına,
Gətdi sür`ətilə tez Əkbərin qabağına,
Durdu birdən ağladı, məhşəri çıxartdılar.

Bülbülə nə hal olar görsə qönçə yarpağın,
Əkbərin dolub gözü şiri-xari görcəyin,
Aldı öpdü ləblərin bir də öpdü qundağın,
Ta bələkdən açdılar əlləri çıxartdılar.

Ta iki susuz dodaq dəmbədəm öpüşdülər,
Gərdi-matəmə hərəm, yeksərə bələşdilər,
Hey olar öpüşdülər, hey bular mələşdilər,
Əl gedib bağlara zülfləri çıxartdılar.

## *Həzrət Zeynəbin (ə) zəban hali (rövzə)*

Bu qədər bilməzdim bivəfadı kufəlilər,
Əmiri fasiqilə həmsədadı kufəlilər.
Dedim ki, hörmət edərlər görəndə mehmanı,
Bu rahü-rəsmə yəqin aşnadı kufəlilər.
Yeyiblər duz, sora sındırıblar nəməkdanı,
Nə qədər pəst, nə çox bihəyadı kufəlilər.
Dolandırıb üzünü baxdı mərdümə Zeynəb,
Sitəmləriz dedi bi intihadı, kufəlilər.
Peyğəmbər oğluna siz xarici xitab eylədiz,
Bu töhmətiz bizə çox narəvadı, kufəlilər.
Həna yaxıb əlizə gəlməsiz tamaşaya,
Sizin də işrətiz axır fənadı, kufəlilər.
Bu qədər dil yarası vurmayın Əli qızına,
Ölübdü qardaşı qərqi-əzadı, kufəlilər.
O baş ki,daş vurursuz nizədə dodaqlarına,
Cida başında sizə rəhnümadı, kufəlilər.
Verin mənə o başı, siz ki, bilmədiz qədrin,
Cahanda dərdimə vallah dəvadı, kufəlilər.
Əlim çataydı əgər qəhrəman Əbulfəzlə,
Ürək sözün eləyərdim bəyan Əbulfəzlə.
Deyərdim olsun iraq gözlərindən, ay qardaş,
Gilayəmi eyləyərdim cəvan Əbulfəzlə.
Bu dövri-bərdə əgər olmasaydı naməhrəm,
Başın bəlasın edərdim əyan Əbulfəzlə.
Açıb kürəkdə olan taziyanələr yerini,
Verərdim həsrət ilə ta nişan Əbulfəzlə.
Əgərçe bəsdi onun öz müsibəti özünə,
Desəm də çarəsi yox mehriban Əbulfəzlə.
Nə vardı əl bədəndə, nə başı peykərdə,
Əza tutubdu anam canfəşan Əbulfəzlə.

Salıblar bir hala başın deyəm dilim gəlmir,
Gərəkdi saxlaya yas qüdsiyan Əbülfəzlə.
Hamıdan artıq onu səsləyir Səkinə balam,
Olubdu yol uzunu nagiran Əbulfəzlə.
Elə ki,Şümrü-sənanın əlində qamçı görür,
Edər təvəssül o şirinzəban Əbulfəzlə.
Deyir bu cümləni ey əmirü-əşcəi-nas,
Yubanma dadıma gəl, hardasan əmi Əbbas,
Fəda olum sənə, tez gəl haraya, ya Əbbas.
Diyari-Kufədə indi sən qiyamətə bax,
Çıxıbdı zülmü-sitəm gör səmaya, ya Əbbas.
Gələn-gedən verir axır bu zarə dil yarası,
Dözüm nə qədər mən axır cəfaya, ya Əbbas.
Denən ki, az başıma qamçı vur, evi dağılan,
Amandı tapşır o Şümri-dəğaya, ya Əbbas.
Haraya gəlməsən indi gedər bibim əldən,
Salıblar çox onu rəncü-bəlaya, ya Əbbas.
Əliyyü-Əkbər atmasın məni gözdən,
Mənim ki, çatmır əlim Kərbəlaya, ya Əbbas.
Öpəm o qanlı dodaqlarını məni xəstə,
Əlim yetişmiri nuki-cidayə, ya Əbbas.
Deynən ki, qardaş olar bacının havadarı,
Eylə mənim tərəfimdən gilayə, ya Əbbas.
Demirəm heç bacıyam, bir yetim xun ciyərəm,
Gəl Allaha görə viran səraya, ya Əbbas.

## *Həzrət Zeynəbin (ə) əhvalatı (rövzə)*

Nizə başında başın lalə əhmərdi, Hüseyn,
Ya ki, on dörd gecəlik mahi-münəvvərdi,
Hüseyn.
O kəsik başına qardaş, bacının canı fəda,

Əli əldən üzülən Zeynəbə rəhbərdi, Hüseyn.
Əmr elə Zeynəbə qoy hökmünü icra eyləsin,
Sənin hökmün mənə çün höccəti davərdi,
Hüseyn.
Qoymaram kufəlilər hqqını pamal eləsin,
Dilim ağzımda bilirsən iti xəncərdi, Hüseyn.
Gəlmişəm Kufəyə düşmənləri rüsva eliyəm,
Dəvənin üstə kəcavə mənə səngərdi, Hüseyn.
Gərçe ənsarım ölüb, yox mənə imdad eyləyən,
Bir bölük qara ləçək qız mənə ləşgərdi, Hüseyn.
Versələr başəvi zülfümlə gülün silim özüm,
Görələr qəm günü Zeynəb necə xahərdi, Hüseyn.
Oxu Qur`anı, bacın aləmə təfsir eləsin,
Hamı bilsinlər bacın yaxşı süxənvərdi, Hüseyn.
Oxu Qur`anı nənəm Fatimə qurban səsinə
Uca nizə yaralı başına minbərdi, Hüseyn.
Oxu xoş ləhnilə Qur`an rəcəz olsun bacına,
Çarə yox, çubi-məhmil mənə xəncərdi, Hüseyn.
Gözün olsun balalarda mənə heç fikr eləmə,
Bağrıqan qızlara bu şəhri də məhşərdi, Hüseyn.
Əl çalanların hələ fikrini çox eyləmirəm,
Gərçe dil yarələri qəlbimə nəştərdi, Hüseyn.
Daş atanlardadı fikrim, odu halım pozulub,
Hər bəla gəlsə mənə zarü müqəddərdi, Hüseyn.
Qorxuram daş dəyə birdən bu şirindil balaya,
Sıxılıb qoltuğuma xırda kəbutərdi, Hüseyn.
Dəysə daş taqəti yoxdur, dəvə üstdən yıxılar,
Öldürər Zeynəbi axır bu qızın dərdi, Hüseyn.

## *Həzrət Zeynəbin (ə) Kufədə zəban halı*

Sər nizədə  Qur`an oxuyan başına qurban,
Başdan tökülən qanına göz yaşına qurban.

Ey Fatimənin ruhu, axan qanına qurban,
Dindir məni canım o susuz canıa qurban,
Həm qanına, həm canına, imanına qurban,
Bu Kufənin əhli səni nə hala salıbdı,
Sər nizədə başın, bədənin yerdə qalıbdı.

Əfsus ola Zeynəb ürəyi yandı dubarə,
Gördü yaralı başa vurublar yenə yarə,
Şiddətlə xanım göz yaşını tökdü üzarə,
Həsrətlə bacı əllərini bir-birə vurdu,
Birdən dedi qardaş, başını məhmilə vurdu.

Qanlı başına daş vuran aramımı aldı,
İstəkli bacın ölmədi aya necə qaldı,
Zeynəb də Hüseyncan, başına məhmilə çaldı,
Qan süzdü başımdan o zaman ki, yerə qardaş,
Az qaldı Səkinən özünü öldürə, qardaş.

## *Bibi Zeynəbin (ə) əhvalatı*

Zeynəb kimi bəlalı görməz birin zəmanə
Bir gündə yeddi qardaş birdən boyandı qanə
Əlləri başında gəldi Zeynəb o gün fəğanə
Zeynəb Zeynəb ya Zeynəb[2]!

Kərbübəla çölündə Zeynəb düşüb bəlaya,
Rəhm etməyibdi düşmən övladi-Müstəfaya,
Öldürdülər Hüseyni, Zeynəb batıb əzaya,
Zeynəb, Zeynəb, ya Zeynəb![2]

Ol şəhri bivəfada Zeynəb dübarə yandı,
Görcək yaralı başı rüxsara qan rəvandı,
Səsləndi qardaşım vay, Zeynəb qana boyandı,
Zeynəb, Zeynəb, ya Zeynəb[2]!

Qardaş, yaralı başa düşmən veribdi yara,
Yandırdılar Hüseynim, bu qəlbimi dübarə,
Səbr eylərəm yolunda gər getsəm hər diyara,
Zeynəb, Zeynəb, ya Zeynəb[2]!

Görcək bu Kufə şəhrin Zeynəb nə hala qaldı,
Qəmlər alıbdı dövrün rəngi rüxi saraldı,
Kərbübəlada yox-yox, bu Kufədə qocaldı,
Zeynəb, Zeynəb, ya Zeynəb[2]!

Səsləndi düxti-Zəhra, ey dinlərin satanlar,
Qəflətdə siz yatıbsız Qur`ana daş atanlar,
Görmüsüz ağlayırlar şəhrizdə bu qonaqlar?
Zeynəb, Zeynəb, ya Zeynəb[2]!

Gəlmiş bu şəhrə mehman fərzəndi-şahi-mərdan,
Kül yağdırır havadan adın qoyan müsəlman,
Qur`an tilavət eylir rə`si şəhi-mərdan,
Zeynəb, Zeynəb, ya Zeynəb[2]!

### Kufədə Zeynəbin (ə) zəban halı

Dərbədərəm, gözləri giryan mənəm,

Qəmləri dərya ürəyi qan mənəm,
Ya Zeynəb, ya Zeynəb[2]!

Yox anacan Zeynəbinin çarəsi,
Saldı başa yeddi cavan qarəsi,
Öldürəcək Zeynəbi dil yarəsi,
Heyf ola bu Kufədə mehman mənəm.

İndi bu Kufə dolanır başıma,
Rəhm eləyən olmadı göz yaşıma,
Ağlayıram nizədə qardaşıma,
Çoxdu qəmi qəmkeşi dövran mənəm.

Kufəlilər saxlamadı hörmətim,
Öldü Hüseyn, oldu Səkinəm yetim,
Qəmlər əlindən bükülüb qamətim,
Yanam ana dərdi hezaran mənəm.

Yeddi qara başıma saldım, nənə,
Ölmədim axır necə qaldım, nənə,
Ta ki, Hüseynin səsin aldın, nənə,
Səslədim onda bacı qurban, mənəm.

## *Zeynəbin (ə) zəban halı*

Girəndə Kufəyə Zeynəb baxıb cüda başına,
Deyərdi dərdi-delin öz yaralı qardaşına.
Gəlibdi nizədə qanlı başın dilə, qardaş,
Kəlam həqqi oxur əhli-batilə, qardaş.
Dübarə yara vurublar axar başın qanı,
Yanar bəlalı bacın ölsün kül üstə yatmışdın,
Məhasinin bələşib torpağa, külə qardaş.

O qan dolan gözün aç dərbədər əyalüvə bax,
Vurubdu boynumuza Şümr silsilə, qardaş.
Bəlalı başının eşqi salıb bəlaya məni,
Bu hali-zarimi bir kimsə yox bilə, qardaş.
O qədər qamçı vurub Şümr qollarım göyərüb,
Bu qəmlər ilə bacın ölməyib hələ, qardaş.

## *Həzrət Zeynəbin (s) zəban halı*

Vaxt o vaxt oldu qoyub məclisi-əğyar qədəm,
Başda bir iddə ürək dağlı ğəzəlani-hərəm,
Hamı xəstə ənduhü-qəmü-dərdü-ələm,
Ali-ətharı görüb durdu ayaq üstə Yəzid,
Başladı söhbətə ol zalımü-bişərmü-pəlid.

Dedi Zeynəb sizi Allah necə gör xar elədi,
Alıb ənsarini əldən səni biyar elədi,
Gözlərində gününü həmçu şəbi-tar elədi,
Öldürüb qardaşını qəlbini yandırdı fələk,
Məhzərimdə səni qolbağlı dayandırdı fələk.

Zeynəbə gətdi Yezidin sözü şuru-həyəcan,
Qanı az qaldı dayansın özünə verdi təkan,
Dedi zalım, nə dedin, lal olasan bircə dayan,
Vurma töhmət bizə ey fərdi-kəsifi-əməvi,
İftiradan bilirsən pakidi nəsli-Ələvi.

Hübbi-dünya necə həqdən səni gör dur e,ləyib
Belə məlum olur qüdrət səni məğrur eləyib,
Beş günün səltənəti gözlərini kor eləyib,
Fəxr edirsən görürəm baxdıqca hər tərəfə,
Belə fikr eyləmə dünyada çatıbsan hədəfə.

Xarici biz deyilik şərm elə, ey şumi-dəni,
Bu qədər tiri-şəmatətlə nişan etmə məni,
İzzətin zillət olar dəhridə bir gün ələni,
Dəsti-həqq qardaşımın qanını səndən alacaq,
Qara mə`cərilə Səkinəm səni təxtdən salacaq.

Rəvişin ziddi-Xudadır, əməlin mayei-nəng,
Ələnən dini-Xuda ilə varındı səri cəng,
Sitəmilən eliyibsən bu cahanı bizə təng,
Bu qədər bəsdi inad üstə dəxi durma, Yezid,
Qızlarının qabağında o başı vurma, Yezid.

Doğranıb dəşti-bəla içrə Peyəmbər balası,
Qan edib hicrinə göz yaşını Zəhra anası,
Vardı qəlbində Əli Əsğərü-Əkbər yarası,
Gülşənü-güllərinə badi müxalif əsilib,
Zülmilə qardaşımın başı qəfadan kəsilib.

Yandırar nisgili dünyada məni qəm zədəni,
Gəzir əllərdə onun qana batan pirəhəni,
İsti qum üstə qalıb üç gecə-gündüz bədəni,

Bağrıqan qızları cari eləyib göz yaşını,
Nizəyə vurduz onun zülmilə qanlı başını.

Çoxdu bu yarəli başın qəmü-dərdü-kədəri,
Nizə üstə dolanıb kuçə və bazariləri,
Qəlbimi yarələyib qissə təlxi səfəri,
Xeyziranı yerə qoy,qan eləmə göz yaşımı,
Yarmışam Kufədə bir yol ona xatir başımı.

Yeddi qardaşımın hicrində ürək dağlamışam,
Seyli-əşki üzümə həsrətilə bağlamışam,
Ağlayan vaxtı yetimə balalar ağlamışam,
Gecələr sübhə kimi vay Hüseyn vay demişəm,
Yatmayan vaxtı Səkinə ona lay-lay demişəm.

## *Vəfati Zeynəb (s) (sinəzən)*

Gəl diyari-Şama  mehriban Hüseynim,
Zeynəbin verir can hardasan, Hüseynim?
Gəl sorağıma qardaş,gözlərim tökər qan-yaş,
Gəl vəfalı qardaş, gəl vəfalı qardaş!

Mövsümi-xəzanidir,  xətm olur baharım,
Həsrətilə yetdi  başa ruzigarım,
Can verəndə səndən  var bu intizarım,
Sən özün gəl Əbbasım,qoyma xar ola yasım,
Gəl vəfalı qardaş, gəl vəfalı qardaş!

Məndə var bilirsən çox sənə əlaqə,
Sən şəhid olandan yanmışam fərağə,
Gəl görüm camalın can yetib dodaşə,
Gəl otur kənarımda hal-ehtizarımda,
Gəl vəfalı qardaş,gəl vəfalı qardaş!

Əllərim üzüldü yeddi qardaşımdan,
Daim üns tutdum  qanlı göz yaşımdan,
Açmadım ölüncə  qarəni başımdan,
Görməyibdi bir didə  mən kimi sitəmdidə,
Gəl vəfalı qardaş,gəl vəfalı qardaş!

Kaş olaydı indi Əkbərim səlamət,
Başım üstə Qur`an  etməyə tilavət,
Əmməsin qoyaydı  qəbrə dildə həsrət,
Qürbət içrə biyarəm  neyləym, nədir çarəm,
Gəl vəfalı qardaş  gəl vəfalı qardaş!

Nə anam var etsin  nə`şim üstə nalə,
Nə bacım ki, töksün göz yaşım cəmalə,
Kim qoyar Hüseynim  qəbrim üstə lalə,
Bir kəsə gümanım yox, ölsəm ağlayanım yox,
Gəl vəfalı qardaş , gəl vəfalı qardaş!

Gərçe inciyibsən Şamidən bəradər,
Eyləyib cəfalar  qəlbini mükəddər,
Ağlaram o zülmə  ruzi-şəb mükərrər,
Xeyziran cəfalıdı, ləblərin yaralıdı,
Gəl vəfalı qardaş,  gəl vəfalı qardaş!

Səndən ayrılandan  günbəgün saraldım,
Saçlarım ağardı qüssədən qocaldım,
Ətrini həmişə  köynəyindən aldım,
Dürrü-tək xəzinəmdə  saxlaram bu sinəmdə,
Gəl vəfalı qardaş,gəl vəfalə qardaş!

Vardı çox günahın,  et nəva Kərimi,
Zeynəbə həmişə  tut əza, Kərimi,
Göz yaşındı dürri porbəha, Kərimi,
Ruzi-şəb nəva elə, döndər əşgini selə,
Gəl vəfalı qardaş, gəl vəfalı qardaş!

**Mündəricat**

Münacat ........................................................ 3
Münacat ........................................................ 3
Ya ərhəmər-rahimin! .............................. 4
Münacat (Ramazan ayı) ............................ 6
Imam Hüseynin (ə) eşqinə aid ................. 8
Canım Hüseyn (ə) ..................................... 8
Salam olsun İmam Hüseynə .................... 9
Hüseyndir iftixarım ................................. 9
Eşq olsun! .................................................. 10
Dərmanım Hüseyn (ə) ................................ 11
Zəhra əzizi .................................................. 11
Növhə .......................................................... 12
Şur ............................................................... 13
Şur ............................................................... 15
“Şiələr, namaz!” .......................................... 17
Şiələrin müqtədası ...................................... 18
Həqiqi Kə`bə Kərbəladı ............................. 19
Münacat ....................................................... 23
Münacat ....................................................... 24
On dörd mə`suma təvəssül ......................... 25
Güftarə gəlmişəm ....................................... 28
Eşq cazibəsi ................................................. 29
Kərbəla arzusu (cuş) ................................... 32
Kərbəlada Aşura ......................................... 34
Kərbəla məqamı (cuşi) ............................... 37
Ünvanımız Hüseyndir ................................ 39
Kərbəla ......................................................... 42
Məhərrəmin yetişməsi ................................ 44
Nohə ............................................................. 44
Nöhə ............................................................. 44
Cuşi .............................................................. 46

Sinəzən və cuşi ........................................ 47
İmam Zamana (ə.c) xitab ........................... 47
Qundaqı ərşə gedən (cuş) ........................... 50
Kərbəlada imtahan verəm ........................... 52
Kərb və bəla kəlməsinin tə`vili ................... 54
Bacı Zeynəb ............................................. 57
Mən hara Kərbəla hara .............................. 60
Ya Hüseyn,vay Hüseyn! ............................. 63
Təşt qoymaq ............................................ 65
Təşt qoymaq ............................................ 67
(Sinəzən) ................................................. 67
Kərbəlaya vurud ....................................... 70
(Sinəzən) ................................................. 70
İmam Hüseynin (ə) zəbani- halı .................. 72
Zeynəbin zəban hali (nohə) ........................ 73
Aşura gecəsi ............................................ 74
Aşura gecəsi (nohə) .................................. 75
Kərbəlayə daxil olmaq (nohə) ...................... 76
Aşura gecəsi ............................................ 78
Vürude- Kərbəla ........................................ 82
Kəsilə (sinəzən) ........................................ 85
Peyğəmbər vəfatında ................................. 88
Şəhidlər ağasının (ə) zəban halı ................. 89
Ədəbli qardaş ........................................... 91
Əbəlfəzl ................................................... 92
Vəfalı yaralını (sinəzən) ............................ 94
Əbbasın kömək istəməsi ............................ 98
Hüseyni ziyarət edən, Allahı ziyarət edər ərşidə ................................................ 100
Əbulfəzlil Əbbas (ə) şəhadəti ................... 101
Qardaşına (nohə) ..................................... 104
Əbbasın (ə) anası Ümmül-bəninin zəban halı ........................................................ 106
Ümmül-bənin diliycə (nöhə) ..................... 106

Ətşan səqqayəm ....................................... 107
Heydər oğlu ............................................ 109
Həzrət Əbulfəzl (ə) (Cuş)......................... 110
Bayrağa müraciəti .................................. 111
İmam Hüseynin dililə............................... 113
Əmannamə həzrət Əbulfəzl (ə)................ 114
Əbəlfəzlin dililə ..................................... 116
Əbbasın oğlu Əbdullahın zəban halı (sinəzən)
............................................................. 118
Əli-Əkbərin bacısının zəban halı (Sinəzən)
............................................................. 120
Əli Əkbərin zəban halı ............................ 121
İmam Hüseynin (ə) Əli Əkbərə zaban halı
(Sinəzən)................................................ 123
İmam Hüseyn (ə) Zeynəbə zəban halı ...... 125
Hüseynin (ə) Zeynəbə Əli Əkbər üçün zəban
halı ........................................................ 127
Hüseynin Əli-Əkbərə zəban halı ............. 129
Bayatı .................................................... 130
Həzrət Qasimin (ə)zəban halı cuşi ........... 131
Əmisi Hüseynə (ə) xitabı.......................... 133
Səkinə anası Rübabə xitab........................ 135
İmamın Əli Əsğərə zəban halı................. 136
Anası Rübab ........................................... 138
Oxşama.................................................. 140
Oxşama.................................................. 141
Oxşama.................................................. 142
İmam Hüseynin (ə) zəban halı................. 142
Rübabın zəban halı.................................. 143
İmam Hüseynin (ə) zəban halı................. 143
İmamın zəban halı................................... 145
Oxşama.................................................. 145
Rübabın zəban halı.................................. 147
İmamın zəban halı................................... 148

Rübabın zəban halı .................................. 149
Qasimin (ə) anasına zəban halı ................. 150
Hürrün zəban halı .................................... 151
Hürrün şəhadəti ....................................... 153
Aşura gecəsinin növhəsi .......................... 154
Müslümün əhvəlatı ................................. 156
Müslümün diliycə.................................... 159
Bayatılar Müslüm haqda........................... 160
İbrahim.................................................... 162
Abdullahın zəban halı.............................. 164
İmamın Zeynəblə (ə) zəban halı ............... 166
İmam Hüseyn (ə) vidalaşması................... 167
Həzrət Səkinənin zəban halı .................... 169
İmam Hüseynin (ə) vidası......................... 171
İmamın vidası.......................................... 172
İmamın zəban halı ................................... 173
Qətligahın çuxur yeri............................... 174
Zeynəbin (ə) zəban halı (növhə) ............. 175
Hüseynin qətli (rövzə) ............................. 176
Zeynəbin zəban halı ................................ 177
Həzrət Zəhranın (ə) zəban halı................. 178
Zeynəbin (ə) zəban halı ........................... 179
Zeynəbin zəban halı ................................ 180
Səkinənin zəban halı (Nöhə)..................... 181
Zeynəbin (ə) zəban halı ........................... 182
Həzrət Zəhranın (ə) zəban halı (rövzə) ..... 182
Zeynəbin zəban halı (nöhə) ...................... 183
Qətligah (rövzə) ...................................... 184
Saribanın qətlgahda cəfası (nöhə)............ 184
Zeynəbin zəban halı ................................ 185
Zeynəbin zəban halı (rövzə) ..................... 186
Qarəti-xiyam (cuşi) ................................. 188
Şami-Qəriban (nöhə)................................ 189
Zeynəbin zəban halı ................................ 189

Həzrət Zəhra (ə) zəban halı ...................... 190
Şəhidlərin dəfni İmam Səccadın (ə) zəban halı.......................................................... 191
Həzrət Zəhranın (ə) zəban halı ................. 193
Həzrət Zeynəbin (ə) zəban halı (rovzə)..... 194
Zeynəbin (ə) zəban halı............................ 194
Zəban halı Zeynəbin (ə) ........................... 196
Zeynəbin zəban halı ................................. 196
Həzrət Zeynəbin (ə) zəban halı (rövzə)..... 197
Zeynəbin zəban halı ................................. 198
Zeynəbin zəban halı ................................. 200
Zeynəbin (ə) əhvalatı ............................... 202
Zeynəbin (ə) vəfatı................................... 203
Zeynəbin (ə) dərdi-deli............................. 204
Oxşama .................................................... 206
Həzrət Zeynəbə(ə) salam (rövzə) ............ 206
Zəban halı Zeynəb................................... 207
Oxşama .................................................... 207
Şir qadın (Rövzə) ..................................... 208
Oxşama .................................................... 208
Zeynəbin (s) Əbülfəzldən kömək istəməsi 209
Zeynəbin (ə) şəhaməti ( rövzə)................. 209
Zeynəbin (ə) vəfatı................................... 212
Həzrət Zəhranın Əbulfəzl başı üstünə gəlməsi .......................................................... 212
Həzrət Əbulfəzlin (ə) zəban halı Rövzə)... 213
Ərze-hacət (rövzə) ................................... 213
İmamın zəban halı rövzə)......................... 215
Əbbasın balinində İmamın zəban halı....... 215
Əbbasın (ə) zəban halı.............................. 216
Əbbasın (ə) zəban halı.............................. 216
(Yaralı sinə) ............................................. 216
Həzrət Fatimə (ə) Əbəlfəzlə zəban halı..... 217
Əbəlfəzlin (ə) zəban halı .......................... 218

Hüseynin (ə)  sözü.................................... 218
Hüseynin (ə) zəban halı (nöhə)................. 218
Hüseynin (ə) zəban halı (rövzə)................ 219
İmamın zəban halı (nöhə)......................... 219
Sərvi-qamət............................................. 220
Müşkül açan........................................... 221
Qəməri-Bəni Haşimin zəban halı.............. 221
Cavabı imamın (ə).................................... 222
Yaralı namavər........................................ 222
Əba Əbdullahın zəban halı (rövzə)........... 223
Əba Əbdullahın (ə) zəban halı.................. 223
Həzrət Əbulfəzlin (ə) həzrət Zeynəblə (ə)
söhbəti ................................................... 224
Zəhərli ox................................................ 226
Nənəsi Ümmül-bənin .............................. 226
Heydər balası (rövzə) .............................. 227
Qəm günləri (rövzə) ............................... 228
Əbulfəzlin zəban halı (rövzə) .................. 230
Hüseynin zəban halı (nöhə) ...................... 230
Ümmül-bəninin zəban halı (nöhə) ............ 231
İmamın bacısı ilə zəban halı ..................... 232
Qardaş ağlama........................................ 233
Göz yaşı (rövzə)...................................... 234
İmamın zəban halı .................................. 234
Həzrət Hüseynin (ə) zəban halı................. 235
İmamın oğluna zəban halı......................... 236
Əkbərin imdad istəməsi (rövzə)................ 236
Oğul qəmi (rövzə) .................................. 237
Əli Əkbərin başı üstündə İmamın zəban halı
(rövzə).................................................... 238
İmamın (ə) zəban halı (nöhə).................... 238
Əli əkbərin (ə) vidası............................... 239
Həzrət Zeynəbin (ə) zəban hali (rövzə)..... 240
Həzrət Zeynəbin (ə) əhvalatı (rövzə) ........ 241

